*Bu kitab “**Fədai.** Bəxtiyarnamə”*
(*Bakı, Azərbaycan Universiteti Nəşriyyatı, 1957*)
*nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib və ön söz müəllifi: **Qulam Məmmədli**

**894.3611 - dc 21**
**AZE**
**Fədai. Bəxtiyrnamə.** Bakı, “Şərq-Qərb”, 2004, 168 səh.

Azərbaycan ədəbiyyatı tarixində “Bəxtiyarnamə” poeması ilə tanınan istedadlı şair Fədai ənənəvi mövzulu bu əsəri yaradarkən qədim dastana yeni münasibət bəsləmiş, onu öz zövqünə, ruhuna uyğun şəkildə işləmiş, əsas ana xətti saxlasa da, süjet üzərində yaradıcılıq işi aparmışdır. Şair müasirlik duyğusu qüvvətli olan əsərində qədim Şərq əfsanəsini orta əsr insanını düşündürən mənəvi azadlıq problemi ilə, onun nəcib, saf arzuları, müasir həyatı ilə vəhdətdə almışdır.

“Bəxtiyarnamə” formaca “Dəhnamə”, “Tutinamə” və “Sindbadnamə” dastanlarına oxşayır. Əvhədi və Xətayinin “Dəhnamə”si kimi Fədai poemasının da kompozisiyasını onluq şərtləndirir.

Aydın və şairanə dilli əsər özünün dərin humanizmi, mütərəqqi ideya məzmunu, bədii ləyaqətinə görə seçilir.

**ISBN 9952-418-12-1**

Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## ƏSƏR HAQQINDA BİR NEÇƏ SÖZ

"Bəxtiyarnamə" pəhləvi dilində yazılmış qədim dastanlardandır. Bu əsəri XII əsrdə yaşamış Şəmsəddin Məhəmməd Dəqaiqi-Mərvəzi fars dilinə tərcümə etmişdir. Əsərin daha sonra ərəb və türk dillərinə tərcümə edildiyi də məlumdur. XIII əsrdə Cahanşah xan dövrünün şairlərindən Pənahi təxəllüslü birisi onu farsca nəzmə çəkmişdir. Digər bir şair də XVI əsrdə ikinci dəfə bu əsəri şeirlə qələmə almışdır.

"Bəxtiyarnamə" Avropa dillərinə də tərcümə edlmişdir. Məsələn, 1801-ci ildə Londonda Ser Uesli tərəfindən ilk dəfə ingiliscəyə, ondan bir neçə il sonra baron Leskalye tərəfindən fransızcaya tərcümə edilərək, 1805-ci ildə Parisdə çap etdirilmişdir. 1829-cu ildə yenə də Parisdə Kazimirski bu əsəri əl ilə yazdırmış, 1926-cı ildə isə Leninqradda rusca çapdan çıxmışdır.

Əsərin bir neçə dəfə Təbrizdə daş mətbəəsində çap edildiyi də məlumdur.

"Bəxtiyarnamə"nin iki ən qədim nüsxəsi İngiltərədə Oksford şəhərinin məşhur Bodleyan kitabxanasında saxlanılmaqdadır. Həmid Araslı gürcü dilində də "Bəxtiyarnamə" dastanının olduğunu müəyyən etmişdir.

H.Araslı əsərdən bəhs edərkən yazır:

"Həmin mövzu üzərində tədqiqat aparan gürcü alimi A.İ.Kobidze də "Bəxtiyarnamə" əsərinin gürcü dilində iki tərcüməsini müəyyənləşdirmişdir. Bunlardan birisi fars nağılları sırasına keçmiş "Bəxtiyarnamə"nin XVII əsrin sonu və XVIII əsrin əvvəllərində gürcü dilinə edilmiş tərcüməsidir, əsərin mütərcimi məlum deyildir. Bu tərcümə də bütün fars "Bəxtiyarnamə"ləri kimi doqquz nağıldan ibarətdir. İkinci tərcümə isə Y.E.Bertelsin tədqiq etdiyi şair Pənahidən tərcümədir. Bu, 1828-ci ildə A.Sulxanaşvili tərəfindən tərcümə edilmişdir. A.Sulxanaşvilinin tərcüməsi Pənahinin şəxsiyyəti haqqında ətraflı məlumat verən dəyərli bir məxəzdir. Burada Leninqrad nüsxəsinin itmiş hissələrinin də tərcüməsi vardır.

Lakin Fədai tarixdən almış olduğu bu mövzunun əsas süjet xəttini saxlasa da, çox dəyişdirmiş, yeniləşdirmiş, bir sıra epizodlar əlavə etmiş, müəyyən hadisələri yeni şəkildə işləmiş, genişləndirmiş, xüsusilə hadisələrə öz münasibətini ifadə edərək yeni bir əsər meydana çıxarmışdır.

Fədainin "Bəxtiyarnamə" əsəri ümumi bəxtiyarnamələr silsiləsinə daxil olsa da, xalq variantlarından fərqləndiyi kimi, Pənahinin əsərindən də əsaslı surətdə fərqlənməkdədir. Biz bunu əsərin altıncı nağılının xalq variantı və professor Y.E.Bertelsin Pənahidən nəşr etmiş olduğu altıncı nağıl ilə müqayisə etdikdə aydın şəkildə görürük. Lakin bir cəhət nəzər-diqqəti cəlb edir ki,

Fədainin əsəri də Pənahinin əsəri kimi ərəb variantlarına uyğundur. Bu isə hər iki şairin eyni mənbədən istifadə etdiyini aydınlaşdırır"[1].

1945-ci ilin sentyabr ayında "Sovet İttifaqı ilə mədəni rabitə saxlayan İran cəmiyyətinin Təbriz şöbəsi" vasitəsilə Təbrizdə, zəngin nadir kitabları olan Hacı Məmməd Naxçıvaninin şəxsi kitabxanasında saxlanılan bu əsərin yeganə əlyazmasının orijinalının üzündən surəti çıxarılaraq "Bəxtiyarnamə"ni ərəb əlifbası ilə çap etdirmək bizim üçün mümkün oldu.

Haqqında söhbət gedən əlyazması adi kitab ölçüsündə, köhnə kağız üzərində qara mürəkkəblə yazılmışdır. Həmin kitabın cildi yoxdur və nə vaxt yazıldığı da məlum deyildir. Başlıqları farscadır. Onun başından bir neçə vərəq, ortasından bir vərəq, axırından da bir-iki vərəq düşmüşdür. Buna görə də kitabın kim tərəfindən, harada və hansı tarixdə yazıldığını müəyyən etmək mümkün olmadı. Lakin həmin kitabın haşiyəsinə yazılmış bir hadisə kitabın qədim əlyazması olduğunu sübut edir.

Haşiyədə göstərilir ki, guya 1264-cü hicri ili rəcəb ayının 17-də Qurbanəli adlı birisinin altı eşşəyi itmiş, molla Məmməd Saleh Nəhavəndi adlı bir molla bu eşşəkləri tapmağı öhdəsinə götürmüşdür. Bunun üçün molla ilə Qurbanəli arasında əhdnamə bağlamışdı ki, eşşəklər tapıldıqda Qurbanəli bürüncü rəngli eşşəyi mollaya bağışlasın.

Həmin əhdnamə kitabın haşiyəsində yüz ildən daha çox qabaq yazılmışdır. Bundan aydın görünür ki, əsər o vaxt qiymətli bir sənəd kimi əldə imiş. Məlumdur ki, təvəllüd, vəfat və digər tarixi hadisələri keçmiş vaxtlarda Quran və başqa etibarlı sayılan kitabların haşiyəsinə yazardılar. Buna görə də belə qənaətə gəlmək olar ki, o vaxt həmin nüsxə etibarlı bir sənəd kimi saxlanılırmış.

Əldə olan təzkirələrdə "Bəxtiyarnamə" müəllifi Fədai adlı Azərbaycan şairinə təsadüf edilməsə də, hər halda poemanın varlığı bir neçə yüz il bundan qabaq belə bir şairin yaşadığını sübut edir.

İran ədiblərindən Vəhid Dəstigərdi bu əsəri akademik Y.E.Bertelsin məsləhəti ilə 1932-ci ildə Tehranda farsca çap etdirmiş və Cənubi Azərbaycan ədiblərindən mərhum Məhəmmədəli Tərbiyət də həmin kitaba müqəddimə yazmışdı. Müqəddimədə deyilir ki: "Bəxtiyarnamə" farsca yazılmış əfsanələrdəndir. Bu əfsanə Siyistanda baş vermişdir. O, bir-birini təqib edən on əxlaqi hekayə və ictimai rəvayətlərdən ibarətdir ki, bunları şahzadə Bəxtiyar nağıl edərək, öz həyatını ölümdən xilas etməyə çalışır. Nəhayət, o məqsədinə çatıb xoşbəxt olur.

Əsərin məfkurəsi səbr və mətanətli olmaq, işdə tələsməmək vasitəsilə arzuya çatmaqdır.

---

[1] H.Araslı. "XVII–XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi", Azərbaycan universiteti nəşriyyatı, Bakı, 1956, səh. 53.

Bu əfsanənin şivə və üslubu "Əlifleyla", "Tutinamə" və "Sindbadnamə"-yə bənzəyir. Lakin bir çox başqa əfsanələr kimi "Bəxtiyarnamə"nin də tarixi məlum deyildir. Məhəmməd Ovfi "Llibabül-əlbab" adlı kitabında Şəmsəddin Məhəmməd Dəqayiqi-Mərvəzinin tərcümeyi-halından danışarkən deyir ki, o, bu nəsrində səc üsuluna riayət etmiş, "Bəxtiyarnamə" və "Sindbadnamə" üzərində işləmişdir. Çox ehtimal ki, "Bəxtiyarnamə" "Sindbadnamə" əsərindən ixtisar edilmişdir. Necə ki, çap edilmiş "Tutinamə" də hələ çapa verilməmiş müfəssəl və şərhli "Tutinamə"nin müxtəsəridir".

Şübhə yoxdur ki, "Bəxtiyarnamə" poeması ədəbiyyat xəzinəmizin zənginləşməsi nöqteyi nəzərindən böyük əhəmiyyətə malikdir. O, bir çox mədəni xalqların dillərinə ancaq XIX əsrdə tərcümə edildiyi halda, Azərbaycan dilinə daha əvvəl tərcümə edilmişdir. Həm də sadəcə tərcümə deyil, təbdil və yenidən işlənmə şəklində verilmişdir. Fədai, əsərdə olan hadisələrin baş verdiyi yeri dəyişmiş, Azərbaycana gətirmişdir. Misal üçün, farscada Hələb şəhərində olan hadisələri o, Şirvana köçürmüşdür. Habelə hekayələrin yerini və qəhrəmanların adını də dəyişərək, poemanı öz istədiyi kimi tərtib etmişdir. Bu da Fədainin əsər üzərində müstəqil işlədiyini göstərir.

Fədainin dilini və üslubunu saxlamaq, əsərin orijinallığını pozmamaq məqsədilə bir çox sözlər əsərdə olduğu kimi saxlanılır. Misal üçün: neyşə – nə üçün, qamu – hamı, xaçan – haçan, nə vaxt, bilməzəm – bilmərəm, nöşün – nə üçün, netdi – nə etdi, ayıtdı, yaxud eytdi – dedi, varmı ola – varmıdır və i. a. Bu sözlərin olduğu kimi saxlanması, bir də əsərin dilinə baxıb onun yazılma dövrünü düzgün təyin etməkdə tədqiqatçılarımıza kömək edəcəyi məqsədini güdür.

Fədainin təbrizli və ya şirvanlı olması məsələsi də öz növbəsində qarşıda duran və aydınlaşdırılması vacib olan məsələlərdən biridir. Çünki o, bu şəhərlərin hər ikisinə məxsus olan söz və ifadələri işlətmişdir. Misal üçün, yalnız Şirvana məxsus olan neyşə, nöşün sözləri hazırkı Təbriz ətrafında qəti olaraq işlənmədiyi kimi, təbrizlilərə məxsus biləsinə, biləsincə (özünə, yanınca) kimi sözlərə də Şirvanda təsadüf edilməz. Fədai isə bunların hər ikisindən istifadə etmişdir.

Əsərin orijinalında başdan və ortadan düşmüş vərəqlərin mətnini biz Vəhid Dəstigərdi tərəfindən farsca çap edilmiş "Bəxtiyarnamə"dən nəzmlə tərcümə etdik və bu vasitə ilə onun bərpa və təkmil olmasına çalışdıq.

***Qulam Məmmədli***

# AZADBƏXT İLƏ GÜLCƏMALIN GÖRÜŞÜ

Ərənlərdən eşitdim bir hekayət,
Ki, ravi söyləmişdir bir rəvayət,
Əcəm mülkündə sultan ibni-sultan,
Özü xaqani-məğrur, şahi-dövran.
Adı Azadbəxt, məşğuli-işrət,
Başında fikri-badə, gözdə qəflət.
Nə millətdən sorarmış halü əhval,
Nə dövlətçün qılarmış fikri-iqbal.
O sultanın sarayda on vəziri,
Fəsadü fitnənin ustadi-piri.
Vəzirlərdən əlavə bir də sərdar.
Qoşun sərkərdəsi, bir mərdi-hüşyar,
Əmirin can alan dilbər ədali,
Qızının hüsni ziba, gülcəmali.
Vəzirlər macərası, çox müfəssəl,
Açaq söhbət biz ol duxtərdən əvvəl.
O qız ki, hər baxışda can alarmış,
Gözəllər hüsnünə heyran qalarmış.
Kaman qaşlar çəkilmiş yayə bənzər.
Səmavi gözləri dəryayə bənzər
Saçı sünbül, boyu sərvü sənubər.
Nə cürət sərvdə olsun bərabər.
Yanağı lalədən almış nişani,
Dürü gövhər saçarmış gül dəhani.
Buxağında xalı-yanmış sitarə.
Ürəklər ovlayan ol mahiparə.
Kəmalü hüsni çün gəlməz bəyanə,
Əmirin nurididə, həm yeganə
Qızı və dərdinə sirdaş imiş o,
Hamı əsrarinə yoldaş imiş o.
Yerişdə xoş, görüşdə gülcəmalmış.

Adı da surəti tək Gülcəmalmış.
Əmirə olmuş idi böylə adət,
Qız ilə görüşüb qılmazsa söhbət,
Qəbul etməz nə elçi, nə ərizə,
Olar xəstə dönərmiş bir mərizə.
Əgər bir gün görüş tutmazsa əncam,
Əmiri-ləşgər olmazdı dil aram.

* * *

Baharın şən çağında, xoş zamanda,
Şəhərdən çox uzaqda, bir məkanda,
Əmir oldu gülüstan səmtə azim,
Yanında vardı əyanü mülazim.
Çəmənzarə yetib oldu piyadə.
Ki, nagah Gulcəmalı düşdü yadə.
Bu firqətdən xəyalı oldu qəmgin.
Və əmr etdi ki, xadim şəhrə getsin.
Olunsun Gülcəmal da seyrə dəvət,
Ki, bəlkə xoş keçə bu eyşü işrət.
Demiş – "Onsuz keçən gün düz deyildir
Qızım yoxsa, günüm gündüz deyildir".
Bəli, sadir olunca hökmü fərman,
Əmirin qasidi şəhrə şitaban[1],
Gəlib ol dəm qıza etmiş ki, ixbar:
– Atan gözlər səni zinhar, zinhar!
Bu sözdən Gülcəmal olmuş sərəfraz.
Qanadlı quş kimi etsinmi pərvaz?
Ata xidmətinə getmək üçün o,
Əmirin vəslinə yetmək üçün o,
İşıqlı günmü, yainki tarik?[2]
Buyurmuş ki, görülsün hər tədarik.
Çağırsınlar haman dəm saribani,
Yola hazırlasınlar karivani.
Kəcavə bəxş edilsin Gülcəmalə,

[1] Təcili
[2] Qaranlıq

Ki, sürətlə yetişsin o vüsalə.
Xülasə, göstəriş əncamə yetmiş,
Səfər hazırlığı itmamə yetmiş.
Kəcavə içrə ol mahi-zəmanə,
Kəmali-şövqilə olmuş rəvanə.
Qəzanın işlərinə qıl nəzarə.
O gün çıxmışdı sultan da şikarə.
Gəzərkən çölləri tapmaq üçün ov
Olub bir nazəninin hüsnünə ov.
Uzaqdan gördü çün ol karivani,
İşarə qıldı gəlsin, Karidani.
Vəzirə söylədi: – Ey mərdi-hüşyar!
Bizə gəl mətləbi sən eylə izhar!
Kimə aid ola səncə bu xərgah?
Bizi bu qissədən gəl eylə agah.
Nədir məqsəd səfərdən karivanə,
Haraya, hansı səmtə ol rəvanə,
Olub getməkdədir. Eylə bəyan sən,
Bu sirri gəl bizə eylə əyan sən!
Vəziri-Karidan gəlmiş hüzurə;
Nihan əfkarini vermiş zühurə:
– Ki, ey şahi-cahan, sultani-aləm!
Həmişə sən olasan şadü xürrəm,
O bir güldür ki, min gülzar içində,
Onun manəndi yox dərbar içində.
Gözəllər cənnətində hurü qilman,
Cavahirlər içində dürri-qəltan,
Cəmali gül saçar bu gülcəmalın,
Əmir bağında bitmiş növ nəhalın,
Atası eyləmişdir çünki dəvət,
Səyahət əzminə qılmış iradət.
Şimaldan bir külək şiddətlə əsmiş,
Vəzirin söhbətin ağzında kəsmiş,
Kəcavə pərdəsin atmış kənarə,
Günəş çıxmış bulutdan aşikarə.
Edib şahi yerində matu-məbhut,
Qılıb ağlını başdan məhvü nabud.

Məhəbbət tirinə olmuş nişanə,
Çətindir vəsfini almaq bəyanə.
İki göz bir-birinə çünki qarşu
Tutuşdu, qəlblərdə nicə duyğu.
Görüncə şahı qız, bir dəm dayandı.
Sanasan eşqidən odlara yandı.
Vücudi eşqdən almış hərarət,
Ürəkdə qalmamış aramü taqət.
Vəzirdən məsləhət sormuş o sultan,
– Nə etmək kim bu müşgül[1] olsun asan?
İradəm var, bu dilbər yarım olsun.
Ənisü munisi-dildarım o olsun.
Saraydan qoy ucalsın sazü avaz,
Qanad çalsın səmadə mürği-şəhbaz.
Geri dönmək, şikari bərhəm etmək,
Onunla birləşib amalə yetmək.
Vəziri-Karidan vermiş cavabi,
Nəsihətlə belə etmiş xitabi,
Demiş: – Şahın sözü eyni həqiqət,
Vəlakin bizdə vardır boylə adət,
Onu almaq gərək şər’ə müvafiq.
Hamı şahdan ola razi xəlayiq.
Atasını əgər qılsan xəbərdar,
Olar asan sənə hər kari-düşvar[2].
Rəvan eylə qıza bir elçi getsin,
Əmiri öz evində müxbir etsin.
Vəlakin qılmasan meylincə rəftar,
Açar düşmən dili böhtanə göftar.
Şəhin haqqında söylər nasəzalər
Salıb şərrə, deyərlər iftiralər,
Əgər səbr ilə rəftar etsən əlan
Daha olmazsan axırda pəşiman.
Vəzirə söyləmiş: – Sakit və xamuş,
Nə lazım, verməərəm bu sözlərə guş[3].

---

[1] Çətin
[2] Çətin iş
[3] Qulaq

Səni aqil sanıb etdim sualı,
Sən isə sərsərisən, laübali.
Çəkil, rədd ol, mənə etmə nəsihət!
Nədir elçi, nədir qayda, şəriət?
Mənə tabe ikən bu mülki-dünya,
Nə istərsəm gərək olsun mühəyya.
Vəziri-Karidan, pəjmürdə, qəmgin,
Vəlakin şahə qarşı qəlbi pürkin.
Düşündü: "Gər taparsam qız atasın,
Yəqin et alaram səndən qisasım!".
Qızın eşqiylə məst olmuşdu sultan,
O saat sadir etdi boylə fərman:
"Gözü ceyran baxışlı bir cahandar,
Məni öz hüsnünə etmiş giriftar.
Çalınsın təbl, gəlsin cümlə əyan.
Büsati-toy məhəyya olsun əlan,
Qayıtmaq paytaxtə işbu saət,
Bu əmrə etməli cümlə rəayət!".
Günəş nuri üfüqdə çünki söndü,
Şikar əhli təmamən şəhrə döndü,
Quruldu məclisi-əqdü nigahi[1],
Hamı təbrik qıldı padişahi,
Edib məclisdə hazır Gülcəmali,
O dəm qazi belə verdi suali:
– Səadət ulduzu, fərxəndə ey qız!
Gözəllər hüsnünə şərməndə ey qız!
Həyavü ismətin ondan ziyadə,
Yetişsin şahımız sənlə muradə.
Duayi-xeyrilədir bu xitabım,
Rizayi-qəlbilə gəl ver cavabım,
Qaçırma gəl əlindən bu şikari;
"Bəli" söylə ki, olsun əqd cari.
Hamı dalmış sükutə, matü-heyran.
Rizayi əqd verdi mahi-taban,
Çalındı təblü kusi-şadiyanə,

[1] Kəbin məclisi

Ata olarmı bundan şad ya nə?
Dedi sultan: – Əmirə namə getsin,
Onu bu qissədən qoy agəh etsin.
Yazıldı namədə: “Ey mərdi-dövran!
Ki, damadın mübarək, oldu sultan.
Gözün aydın ola ey miri-ləşgər[1],
Ki, sultan Gülcəmalə oldu həmsər!”[2].
Vəziri-Karidanə çatdı fürsət,
Qisas almaq üçün lazımdı xidmət.
Dedi sultanə kim: ey padişahim!
Başımın kölgəsi, həm qibləgahim!
Əgər versə şəhim bir dəm icazə,
Dönüb bir anda mürqi-şahibazə,
Alım bir muştuluq dəsti-pədərdən[3],
Edim hali onu bu xoş xəbərdən.
Vəzirin xahişi sultanə yetdi,
Alıb da naməni icrayə getdi.
O çatdı çün əmirin xidmətinə,
Dedi: – Sultan toxundu izzətinə,
Zor ilə aldı getdi Gülcəmali,
Edib rüsvayi-dövran xoş xisali,
Bütün zəhmətlərin də getdi badə.
Qoyub həsrət səni vəsli-muradə.
Alıb övladını səndən xəbərsiz,
Özünə övrət etmişdir səmərəsiz,
Bu hörmətsizlik səninçün bəlkə azmış
Hələ bu namədə gör bir nə yazmış?
Tamamən boş, yalan, əfsanə sözlər,
Həqiqətdən uzaq, biganə sözlər”.
Əmirin caninə düşdü şərarət,
Odur ki, şahə qarşı doğdu nifrət,
Axıtdı gözlərindən qanlı yaşi,
Sanasan zəhrə döndü dadlı aşi.
Vəzirə üz tutub etdi suali:

[1] Qoşun başçısı
[2] Ər, adaxlı
[3] Atanın əlindən

Nədir tədbir, məni gəl eylə hali?
– Sənə lazım, – dedi, – əlbəttə tədbir
Qisas almaq üçün hər dürlü təzvir.[1]
Yazıb bir namə şahə sən dua qıl!
Mübarəkbadlıq əmrin sən əda qıl.
Təşəkkür et ona, zahirdə əlbət,
Bu şərtilə qala batində nifrət.
Yaz: "Ey şahim, mübarək, min mübarək!
Bu toy olsun sənə daim mübarək!
Yolunda hazıram candan keçəm mən,
Nə çarə eyləyim ki, bir heçəm mən.
Dilim aciz qalıb sözdən, kəlamdan,
Kim eylər imtina bu ehtiramdan?
Səadət badəsindən sərxoşam mən.
Təbibi şah olan bir naxoşam mən.
Nicati-ömrümün Loğmani sənsən,
Davasız dərdimin dərmani sənsən.
Yetirdim ərzimi bəndə təmamə,
Nədir hökmün, büyür kəmtər qulamə?.."[2]
Yazıldı namə çün tapdı sərəncam,
Günəş söndü səmadə oldu axşam.

## ƏMİRİN FİTNƏSİ

Keçər günlər, ötər aylar, sərasər,
Cahanda vəsli-yarə yox bərabər.
Cəmali-dilbərə məftundu sultan,
Vüsali Gülcəmalə matü-heyran,
Edərkən yar ilə həmsaz dəmlər,
Nişati zövqilə pərvaz dəmlər,
Düşünməzkən nədir hali diyarın,
Olub məftun fəqət ruxsari yarın.
Günüzlər həmdəmi saqərlə badə,

---
[1] Hiylə
[2] Alçaq nökər

Gecələr məst olub ondan ziyadə.
Nə bilsin kim, kəmində gizlənən var.
Onu hər bir dəqiqə izləyən var.
Ərənlər söyləmişlər: "Mərdi-aqil,
Unutmaz düşməni, etməz təqafil".
Görüb qəflət dəmində hökmdari
Əmir aldı ələ küll ixtiyari,
Qurub məclis evində xəlvət etdi.
Vəziri həm vəkili dəvət etdi.
Açıb dil söhbətə iqrarə gəldi,
O, gizli mətləbi izharə gəldi.
Dedi: – Sizdən deyil məxfi xəyalım,
Əlimdən getdi nazlı Gülcəmalım!
Nə qədri xidmət etdim padişahə,
Vəli verdi cəza mən bipənahə.
Olub rüsvayi-aləm mən diləfkar,
Əlindən padişahin eylərəm zar.
Edirdim dövlətə vicdanla xidmət.
Vəli etdi mənə sultan xəyanət,
Olub əyanu əşraf cümlə xamuş,
Əmirin sözlərinə verdilər guş.
Vəziri-Karidan, ol mərdi-hüşyar,
Cavabında əmirin etdi ixtar,
Dedi: xidmətlərin zənnimcə məşhur,
Qoşun sərkərdəsi, ey mərdi-məğrur!
Sənin tədbirinə yox şübhə əsla,
Sənə layiqdi məsnəd ərşi-əla.
Fəsadü fitnəyə qoydun nəhayət.
Sənə ümmid olan çəkməz nədamət.
Vəzirlər cümləsi qarşında hazır.
Nə söylərsən onu icrayə nazir,
Əgər şahdan qisas almaq dilərsən,
Bizi öz əmrinə sadiq görərsən.
Hökumət məsnədinə o nə layiq?
Bu tacü dövlətə sənsən müvafiq.
"Bizə çün zahir olmuşdur həqiqət".
Olub vacib edək ərzi-iradət.

“Qilalım canü baş bu yolda qurban.
Gərək məxlu[1] ola mütləq bu sultan”.
O dəmdə birləşib əşrafü əyan,
Bu tədbiri pəsənd etdi vəziran,
Qoşun amadə oldu həmlə etsin,
Qəfildən barigahə doğru getsin.
Tutub zindanə salsın şahi ol dəm.
Vəlakin cümlə tədbir oldu bərhəm.
Şaha sadiq olan bir şəxs dərhal,
– Nə yatmışsan! – demiş – şahım bu münval!
Xəyanət dalğası ətrafı almış.
Gəmidə seyr edənlər keyfə dalmış.
Başının gec deyilkən çarəsin qıl!
Hərə fürsət var ikən olma qafil!
Düşüb təşvişə sultan bu xəbərdən,
Xilas olmaq üçün şərrü xətərdən,
Düşündü çarə tapsın bu məlalə,
Xəbər vermək gərəkdi Gülcəmalə.
Çıxıb ol dəm sarayə doğru getdi.
Otaqlardan birini xəlvət etdi.
Dedi: – Ey bəxtimin parlaq çırağı!
Təlaş etmə, vəlakin al soraği.
Sənin eşqin mənə vermiş səadət,
Toxunsa gər yolunda canə afət!
Qəbulə hazıram, çəkməm nədamət,
Gələn hər bir cəfa mənçün şərafət.
Vəlakin hər tərəfdə qiylü-qaldır.
Bu sevdadan xeyir görmək mahaldır.
Səfərçün çəkməli hər cür sərəncam,
Diyari tərk edib mütləq bu axşam,
Gedək Kirman-zəminə sürət ilə.
Bizi mehman edərlər hörmət ilə,
O mülkün padişahi Dadpərvər,
Kəramətdə, səxavətdə hünərvər,
Olub mehman ona bir xeyli müddət,

[1] Taxtdan düşürülə

Dözək hər bir cəfayə, düşsə fürsət,
Edək övdət yenə də bu diyarə,
Budur əlbət bizimçün rahi-çarə,
Var idi çün sarayda gizli bir rah.
O rahın varlığından qeyr əz[1] şah,
Nə bir xadim, nə bir nazir, nə sərbaz,
O gizli qapıdan girməz və çıxmaz.
Yəhərləndi iki köhlən səməndər,
Yükü xurcun dolu sim[2] ilə həm zər,
Suvar oldu ata ər ilə övrət.
Ravan oldu yola əz rahi xəlvət[3].
Kəmali-sürət ilə getdilər hey...
Uzun yollar boyunu etdilər tey,
Aşıb dağdan, keçib bir xeyli səhra,
Nədir qorxu, xətər, heç bilməz əsla.
Ağır yollar əzabından yorulmuş,
Hərarətli günəşdən xəstə olmuş.
Ətəş salmışdı şahi sanki candan,
Yol üzrə bir bulaq oldu nümayan,
– Bulaq başında bir dəm istirahət,
Edəlim, – söylədi sultan nəhayət.

## BƏXTİYARIN DOĞULMASI

Qəzara Gülcəmalın vaxtı keçmiş,
Analıq badəsin çoxdandı içmiş,
Ki, vəz'i-həml[4] üçün çatmışdı saət,
Çəkib ağrı nəhayət oldu rahət.
Gəlib dünyayə nazəndə bir oğlan.
Nə oğlan? – Sanasan bir mahi-taban.
Günəşdən bac alır hüsnü cəmali,
Gözündən bəllidir əqlü kəmali.

---

[1] Şahdan
[2] Gümüş
[3] Xəlvət yoldan
[4] Doğmaq

Ananın gözlərində mahi-mənzər,
Açılmış qönçeyi-həmrayə bənzər.
Dedi sultan: əzizim eylə tə'cil,
Gedib Kirmanə çatmaq xeyli müşkül,
Qəbul eylə sözüm ey nazlı canan!
Nə qədri müşkül olsa dərdi-hicran,
Dözüb cövrü cəfayə bu məkanda
Uşaği tərk qılmaq; hər zamanda.
Nəhayət fürsəti fot etmə zinhar!
Bu fikrim məsləhətdir, eylə rəftar.
Ana çəkdi ürəkdən ahi-cansuz,
Dedi: – Müşküldür əmrin, həm amansız.
Mən ayrılmam ölərsəm öz balamdan
Nə mümkün ayrıla bir cism candan?
Ayırma canı candan, olma qəddar!
Bu tifl olsun cahanda mənə qəmxar.
Bizi tərk et yolundan qalma şahim!
Ola bəlkə bu səhradə pənahim.
Bu ahü nalədən şah almadı pənd[1],
Çalıb tifli anadan seyd-manənd[2],
Bələk etmiş ona zərrin qəbasin,
Sarımış körpəyə tirmə əbasin.
Bələk içrə qoyub on dürrü gövhər.
Deyib: "Olsun uşaqla qoy bərabər,
Hər ol şəxsi ki, etdi tiflə xidmət,
Qoy olsun bu cəvahir ona qismət".
Cəfasi padişahın etdi tuğyan,
Ayırdı Gülcəmali yavrusundan.
Tutub Kirman yolun birahə getdi,
Gəlib on gün sonra məqsudə etdi.
Uzaqdan bir şəhər oldu nümayan,
Soruşdu, söylədilər, adi Kirman.
Edib qasid rəvanə ol diyarə,
Xəbər göndərdi ol dəm şəhriyarə.

---

[1] Nəsihət
[2] Ov kimi

Dedi: – Hakim verərsə əmrü fərman,
Gələrdim mən sərayi-şahə mehman.
Xəbər şahə çatınca oldu xoşnud,
Boyurdu hazır olsun cümlə mə’bud,
Gedin də’vət edin Azadbəxti,
Əziz mehmanə keçsin şad vəxti,
Səf-əndərsəf düzüldü əqniyalər,
Rəvan pişvazə oldu pişvalər,
Çalındı təblü küsü nayü şeypur,
Qətari-ləşgər oldu şəhridən dur.
Misilsiz hörmət ilə, izzət ilə,
Saraya doğru gəldi şövkət ilə.
Əziz mehmanə layiq mehribanlıq.
Bəsi[1] cansuzluq, həm canfişanlıq,
Qılıb Azadbəxtə şahi-Kirman,
Dedi: – Xoşdur bizə didari-xuban[2].
Vrudindən[3] mən oldum şadü xürrəm.
Başından sayəyi-həqq olmasın kəm.
Buyurdu qullara ol xubkirdar: –
– Deyin gəlsin sarayə hər nə kim var,
Çalanlar, oynayanlar, nəğməxanlar,
Büsati-badədən qismət alanlar,
Deyin bu məclisə sazəndə gəlsin,
Və tanha gəlməsin, nazəndə gəlsin,
Qədəhlər oynasın, saqi qol açsın,
Şərabın ətrini ətrafa saçsın!
Quruldu məclisi-mey, badə gəldi,
Müğənnilər o dəm amadə gəldi.
Ucaldı asimanə şurü şəhnaz,
Sədayi-ud etdi ərşəpərvaz,
Kəmanın tellərindən qopdu nalə,
Dili-uşşaqə[1] açdı yolu şəlalə.
Gözəllər rəqisinə meydan verildi.
Nişatü eyş üçün imkan verildi.

---

[1] Çox
[2] Gözəllərin görüşü
[3] Gəlişindən

Nəzər saldı çü şah ol Azadbəxtə,
Ürəkdən qan axır san ləxtə-ləxtə,
Qəmü-qüssə onu etmiş əhatə.
Nədən biganə qalmış bu büsatə?
Dalıb fikrə xəbərsizdir cahandan,
Olub Kirman şəhi bu halə heyran,
Dedi: – Söylə neçin fikrə dalıbsan?
Bu halinlə bizi şəkkə salıbsan?
Məgər mehmannavazlıqda qüsur var?
Nihan tutma, bizi eylə xəbərdar,
Dedi Azadbəxt: – Ey şahi-vala!
Sizə çox ömür versin Həqq-təala,
Bu eyşü-işrətə biganəyəm mən,
Qəmü dərdə yanan pərvanəyəm mən.
Gedib əldən büsatü ehtişamım,
Duman almış fəzayi-asimanim.
Xəzinəm, dövlətim, izzü cəlalım,
Olub qismət əduyə[2] mülkü malım,
Qalınca dəsti-düşməndə mülk bərbad,
Olarmı qəlbi-zarım qəmdən azad?
Şəhi-Kirman ona etdi nəsihət,
Dedi: – Lazım deyil bunca nədamət,
Qəm etmə, mülk üçün olma pərişan!
Olar səbr ilə əlbət müşkül asan,
Gecə getsin, səhər gəlsin arayə,
Gələr əlbət sənə bir kəs harayə?
Qaranlıq pərdəsi göydən qaçarkən,
Günəş nuri səmayə yol açarkən,
Vəzirlər barigahə oldu də'vət,
Şəhi-Kirman bu növü etdi söhbət:
– Belə sadir olur bizdən iradə,
Binayi-cəng üçün atlı, piyadə,
Təmamən hazır olsun pəhləvanlar,
Döyüşdə ad qazanmış qəhrəmanlar,
Hücuma hazır olsun mərdi-meydan,

[1] Aşiqlərin ürəyi
[2] Düşmən

Bu növi əmr edibdir şahi-Kirman,
Şəhin nitqi haman itmamə yetdi,
Qoşun hazır olub icrayə getdi.
"Gəlib qəl'ə yanında, durdu sultan,
Yığıldı üstünə ləşgər firavan,
Yeridi hər tərəfdən çün ələmlər
Biri birinə çün əl açdı ləşgər,
Vuruşdu qeyrət ilə pəhləvanlar,
Töküldü hər tərəfdən çoxlu qanlar.
Sınıb ordu ələm oldu nikunsar,
Qırıldı ləşgəri düşmən nə kim var".
Olub Azadbəxtin bəxti hasil,
Sərayü təxtü tacə oldu nayil,
Zəman keçdi, fəramuş oldu hər zad,
Ürəkdən getmədi bir dərdi evlad,
Bulaq başı düşərdi yadə hər gün,
Oğul fikri onu eylərdi qəmgin,
"Onu yaxdi fəraqi-nari-hicran.
Bu dərdə varmı ola heç dərman?
Onu dərd aldı, dərman getdi əldən,
Yanardı cani çün, can getdi əldən".

## ZİYAD HƏRAMININ UŞAĞI TAPMASI

Bu yerdə mətləbə vermək nəhayət,
Bulaq başına tutmaq istiqamət.
O səhradə var idi yol kəsənlər,
Çapıb karvani həm talan edənlər,
Haman quldurlara Ziyad hərami,
Edərdi başçılıq, bir mərdi-nami,
Şücaətdə, rəşadətdə yeganə,
Onun mislin görə bilməz zəmanə.
Vəli evladdən məhrum bir zat,
Həmişə eylər idi fikri-övlad,
Gəlib çatdıqda ol dəm çün bulağə,

Sataşdı görzləri bikəs[1] uşağə.
Düşüb atdan, Hərami etdi diqqət,
Ürəkdə hasil oldu çox məhəbbət,
Alıb ağuşə öpdü gözlərindən,
Məhəbbət yaşı axdı gözlərindən,
Görüncə qollarında dürrü yaqut,
Bu halə qaldı quldur matü məbhut,
Dedi: – Bu tifl oldu mənə övlad,
Ona namü nişan verdim: "Xudadad".
Şəhə mənsub olan bir qönçadır bu,
Vəli qismət mənə olmuş bu incu,
Gecə-gündüz qılıb hazır qidasın,
Tədarük eylədi nəşvü nümasın,
Yetişdi, oğlan oldu bir cavanmərd,
Bərabər dura bilməz ona heç fərd,
Fəsahət mülkünün sultani bir gənc
Bəlaqət bağının bağbanı bir gənc.
İgidlər içrə qeyrətmənd çoxdu,
Gözəllikdə ona manənd yoxdu,
At oynatmaqda misali pəhləvandı.
Ox atmaqda əvəzsiz qəhrəmandı.
Nəzirsizdi əgər hüsnü cəmali,
Daha qabil onun əqlü kəmali.
Cinayətdən uzaq bir gənci-rə'na,
Xəyanət fikrinə düşməzdi əsla.
Gülüstani-ədəbdən bac alardi,
Görənlər ağlına heyran qalardı.
Yaşar quldurlar içrə o, bü münval,
Və lakin qarətə olmazdı xoşhal.
"Nikuxislət, təməhsiz, əhli insaf,
Başına and içərdi cümlə əşraf".
Fəqirə rəhm edərdi, tapsa fürsət,
Əsirə əl tutardı, vəxt-bivəxt,
Xəbər çatdı Ziyadə bir gün axşam,
"Yol üzrə karivan var, yatma aram.

[1] Adamsız, yiyəsiz

Gəlir şəhri Hələbdən Hində mayil,
Yükündə əbrşim, zərbəf, həmayil,
Tilavü nüqrənin yoxdur hesabi.
Qənimət bil dəmi, eylə şitabi".
Həramilər olub hazır o həngam,
Ziyad həmlə üçün verdi sərəncam,
Hücumə keçdilər, sağdan və soldan,
Çapıb karvani etmək qarət əl'an.
Vəlakin olmadı mətləb müyəssər,
Hücumla əhli kərvan cümlə yeksər,
Durub qarşı, silah ilə, daş ilə,
Vuruşdular hamısı, can-baş ilə.
Həramilərçün səadət olmadı yar.
Olub məğlub döyüşdə çar-naçar.
Dəyib zərbə Ziyadə, aldı yarə,
Günəş nuri gözündə oldu qarə.
Durub bir guşədə əvvəl Xudadad,
Tamaşa eyləyirdi, sanki bir yad.
Görüncə ol Ziyadi qan içində,
Bulanmış qanına, qəltan içində.
Olub bu qissədən ol müztərib hal,
Əl atdı xəncərə çün Rüstəmi-Zal,
Onun bu həmlədən yox özgə dərdi.
Atasını xilas etmək dilərdi.
Vəlakin güclü düşmən oldu üstün,
Həramilərçün səadət oldu küsgün.
Olub məğlub bütün quldur, qaçaqlar,
Rəisi-karvan, düz etdi rəftar,
Sıra ilə düzüb onları bir-bir,
Təmamən qollarına vurdu zəncir.
– Hüzuri şahə olmaq indi azim,
Cəza vermək sizə əlbəttə lazim.
Gəlib çatsın əsirlər paytəxtə.
Xəbər getsin qoy ol Azadbəxtə,
Həramilər təmamən dəstəsiylə,
Şaha tabedir öz sərkərdəsiylə,
Əmirin hökmü əlbət olsa sadir,
Bizik sözsüz onu icrayə hazir!

## BƏXTİYARIN SARAYA QƏBUL EDİLMƏSİ

Vücudi şahin oldu qəmdən azad,
Buyurdu hazır olsun əmrə cəllad,
Həramilər keçirdi şah önündən,
Xudadadə nəzər saldı o, birdən,
Vücudi titrədi şahin həmana,
Baxınca diqqət ilə ol cavana,
Keçən günlər haman dəm yadə düşdü,
Atıb tərk etdiyi övlada düşdü.
– Nədir ismin?, –
– dedi oğlan, – Xudadad!
– Atan kimdir?
– Hərami, ismi Ziyad!
Dedi söylə: – Nəsən, kimsən, bəyan et?
Bizə öz halü əhvalın əyan et!
Bu hüsnü mə’rifət kim sənin var,
Yararmı ola yarım ol qadaqlar?
Gəlib nitqə Xudadad etdi izah,
Dedi: – Sultan, sən ol halımdan agah,
Olubsa məskənim quldur məkani,
Əlimdən görməmiş kimsə ziyani.
Xəyanət qəsdinə mən açmadım yol,
Və qətlü qarətə qaldırmadım qol.
Həmişə elim üçün etdim iradət,
Əlimdən etmədi kimsə şikayət,
Oğulluq borcumu icra edəndə,
Bu də’vadə gəlib düşdüm kəməndə.
Şəhə xoş gəldi bu sözlər təmami,
Nida qıldı: – Sən ey Ziyad Hərami!
Bu qətlü qarəti tərk etmiş olsan,
Həqiqət rahinə gər getmiş olsan,
Günahından keçər, verrəm əmani,
Əlindən görməsin kimsə ziyani.
Həramilər duaya açdılar dil.
Dedilər: – Qibləgaha, yaşa yüz il,
Bu gün kim, sən bizə qıldın məhəbbət,

Məhəbbət badəsi sevməz xəyanət,
Həyatın qədrini qəlbən qılıb dərk,
Bu gündən qarəti biz eylədik tərk.
Dedi sultan: – Varımdır bir sözüm də,
Xudadad olmalı daim gözümdə,
Saray içrə qalıb da misli-xadim,
Edə xidmət bizə sidq ilə daim.
Çağırdı şah hüzurə ol cavani,
Bu növ ilə qalıb hali-bəyani.
Dedi sultan: – Bu oğlan bəxtiyardır,
İradəmlə adı da Bəxtiyardır.
Əta qıldım hərami dəstəsinə,
Həyatü mərhəmətlər cümləsinə.
Şəhin əmriylə icra oldu işlər,
Vəzifə Bəxtiyarə oldu mehtər,
Sədaqətlə edib xidmət sərayə,
Və dövlət atlarını aldı sayə,
Edib hər bir ata ayrıca diqqət,
Təvilə içrə çox sərf eylədi vəxt,
Edib hər bir ata ol pasibanlıq,
Çəmənzar içrə eylərdi çobanlıq.
Nə yaxşı, bir səhər, sultan nəhayət,
Gəlib atlara baxdı, etdi diqqət,
Olub xoşnud işindən Bəxtiyarın,
Saray içrə ucaltdı ixtiyarın.
– Sənə layiq deyildir mehtər olmaq,
Xəzinə ixtiyarın ələ almaq.
Əmanətdar olarsan dövlətə sən.
Çatarsan şübhəsiz ki, izzətə sən.
Görüb ən’ami-fəxri-şəhriyari,
Rizayi-qəlb aldi Bəxtiyari.
– Təşəkkür eylərəm şahə! – dedi o.
Ki, haqqımda olurmuş bunca qayqu,
Nə qədri var canımda can, həmişə,
Duayi-xeyri-dövlət mənə pişə,
Görüb şah onda fikrü əqlü kirdar,
Tamam dövlət işindən verdi ixbar,

Olub şahin sarayda həmnişini,
Qılardı yad xidmət vərdişini.
Keçərdi ruzigari xoş, sərəfraz,
Yayıldı ölkəyə haqqında avaz.
Ağıllı tədbir ilə Bəxtiyarın,
Günü xoş keçər idi ol diyarın.
Deyildi hər tərəfdə namü-kari[1],
Günü-gündən çoxaldı ixtiyari.

## XAİN VƏZİRLƏRİN PAXILLIĞI

Var idi padşahın on vəziri,
Vəzirlik məsnədinin mərdi-piri.
Həsəd elmində alim, qəlbi pürkin
Xəyalında qərəz, əxlaqi çirkin,
Həmişə fikri qeybət, kari bidad,
Əlindən dadə gəlmiş cümlə əfrad.
Görüncə şah önündə Bəxtiyari,
Ki, almışdır ələ hər ixtiyari,
Yığıldı cümləsi bir vəxti-axşam,
Verilsin bir xəyanətçün sərəncam.
Salıb şahın gözündən ol cavani,
Kənar etmək saraydan tez zəmani.
Olub bu fitnədə hamısı əlbir,
Haman dəm tökdülər bir gizli tədbir.
Keçər günlər, keçərdi yaxşı dəmlər,
Nədir qüssə, o bilməz dərdi qəmlər,
Sarayda xoş həyata dalmiş idi.
Bir axşam barigahda qalmiş idi.
Hamı getmiş, sarayda yoxdu bir kəs.
Olub heyran bu halə neyləsin bəs?
Alıb badə, içib mey, oldu sərxoş,
Apardı xabi-qəflət, oldu bihuş.
Ayıldı bir zaman ki, vəxt keçmiş,

[1] Adı və işi

Tamam dərlər qapali, hamı getmiş,
Saraydan tapmamışdı çıxmağa yol,
Nə etsin, neyləsin ki, bilmədi ol.
Otaqlardan keçib digər otağa,
Təsadüf eylədi bir şəbçirağa.
Salınmış bir tərəfdə zərli yorğan,
Görüncə rəxtixabi sərxoş oğlan.
Uyub tə'siri xumari-şərabə.
Uzandı rəxtixabə, getdi xabə.
Qayıtdı nisfişəbdə[1], şah sarayə.
Təsadüf eylədi bu macərayə
Qalıb heyrətdə birdən, qıldı fəryad.
Səsinə səs verib toplandı əfrad.
Qəzəblə söylədi şah Bəxtiyarə:
– Ayıl bir xabidən ey bəxti qarə!
Nə məqsədlə edib bu əmrə iqdam,
Mənə məxsus yerdə qıldın aram?
Yəqin vardır bu işdə bir xəyanət,
Ki, vermişdir sənə bunca cəsarət!
Edib zəncirə məhkum ol cavani.
Hərəmxanə tərəf oldu rəvani.
Edib bidar yatmış Gülcəmali.
Onunla başladı sorğu-sualı:
– Yatağa yol tabıbsa gər bu miskin,
Bələdçi olmasa gəlmək nə mümkün?
Bu məxfi fitnədən mən bədgümanəm.
Hərəm əhlinə gəlir çün gümanım.
Sənin könlündən almışsa rizani,
Həqiqət söylə, işlətmə yalani.
Bu töhmətdən olub pəjmürdə xatun,
Nə vəchilə inandırsın səbatın.
Dedi: – Ey qibləgahim, padşahim!
Mənim əsla yoxumdur heç günahim!
Qəsəm yad eylərəm, şahın önündə,
Xəyanətdən nümunə yox sözümdə!..

---
[1] Yarı gecə

Kəlami etmədi sultanə tə'sir.
Buyurdu boynuna salsınlar zəncir.
Zəmani ki, açıldı sübhi-sadiq,
Olunca qeydi-şəbdən şah fariq,
Çıxıb təxtdə oturdu, xeyli qəmgin,
Ürəkdə dərdü-qüssə, üzdə təmkin,
İşarə qıldı gəlsin cümlə ə'yan,
Hüzurə daxil olsun, ol vəziran.
Əda oldu çü rə'yi padşahın,
Açıldı qapıları ol barigahın,
Hamı gəldi səf-əndərsəf dayandı,
Şəhin qəlbi qızıl qana boyandı.
Nida qıldı, dedi: – Mən Azadbəxtin,
Olub rüsva nəzərdə tacü təxti.
Xəzinə maliki, ol bidəyanət,
Vəliyyü-ne'mətə etmiş xəyanət,
Vəzirlər hey'ətini qıldı agah,
Təmamən sərgüzəşti etdi izah.

## BİRİNCİ VƏZİRİN FİTNƏSİ

Vəziri-əvvəl ol dəm, tapdı fürsət,
Ki, vursun Bəxtiyarə bəlkə zərbət,
Dil açdı töhmətə, böhtanə dərhal.
Bəyanə gəldi ol, xain bu minval.
Dedi: – Şahim, bu şəxsi mən görən tək
Sizə sadiq olarmı? – Eylədim şək.
Alan nəşvü-nüma quldur-qaçaqdan,
O kim ayrılmadı xəncər-bıçaqdan,
Əgər şüğli olubsa gündə qarət,
Nə mümkündür ola əhli-dəyanət?
Verin bir hökm qoy çəksin cəfasın.
Fəsad əhli gərək alsın cəzasın.
"Dedi neçə təərrüz gunə[1] sözlər".

[1] Etirazlı sözlər

“Ki, sultan bağrına yapışdı közlər”.
“Acıqlandı o dəm hökm etdi sultan”
“Gətirdilər onu iftianü xizan”.
“Dedi: ey Bəxtiyari-bəxti qarə!”
“Gərək qılam səni mən parə-parə!”
“Necə edim səni zindanda məhbus”,
“Mənimçün qalmayıbdır nəngü namus!
Dedi pəs Bəxtiyar: – Ey Bəxtazad!
Həmişə olasan sən xürrəmü şad!
Gər öldürsən məni sən ey şahi-dövran,
Olarsan qorxuram axir pəşiman.
Nə çün kim, ey mənim izzətli şahim,
Bu işdə zərrəcə yoxdur günahım.
Əgər mən gəlmişəmsə barigahə,
Şərab olmuş səbəb mən bigünahə,
Xəyanət qəsdinə mən açmadım əl,
Ki, aqil öz başına açmaz əngəl.
Sarayda tapmış idim mən səadət.
Səadətçün nə mümkündür xəyanət?
Budur axır sözüm sən padşahə,
Məni bədbəxt edib, batma günahə.
Vəzir etdi xitab: ey şahi-vala!
Fəsadın sözlərinə vermə mə’na,
Bu bir fitnə ki, misli yox cahanda.
Nə lazımdır qala əmnü amanda.
Onu ifşa üçün kafidir ancaq,
Hərəmdə Gülcəmaldan sorğu sormaq,
Əgər layiq görülsəm e’timadə,
Daha şübhə yeri qalmaz fəsadə.
Təmam ovzai billəm şübhəsiz mən,
Yəqin ən’am olar müzdüm də sizdən!
Vəzirə izn verdi şahi-ali,
Gedib görsün hərəmdə Gülcəmali.

## VƏZİRİN GÜLCƏMALLA SÖHBƏTİ

– Qızım, söylə nədir bu macəralər?
Sənin haqqında bəlkə iftiralər?
Çəkinmə, doğrusun söylə, özün sən,
Bu çirkin macəranın lap düzün sən.
Qəbul eylə nəsihət, eylə bavər[1],
Mən ollam dar günündə yarü yavər.
Səni şahın gözündə eyləmək pak,
Bu pirin borcudur, gəl olma şəkkak.
Bəyanə gəldi ol dəm pak tinət,
Dedi: – Lazım deyildir bunca minnət,
Fəsadü fitnəyə biganəyəm mən.
Günahsız məhv olan pərvanəyəm mən!
Əlimdən çıxmamış heç bir cinayət,
Dilimdən görməmiş kimsə xəyanət,
Əgər sultan düşübdür bədgümanə,
Gələr bir gün sözün söylər zəmanə.
Dedi: – Bunlar təmam əfsanə sözlər,
Nicatə yox güman, biganə sözlər.
Əgər istər isən tapmaq nicati,
Xilas etmək xətərdən sən həyati,
Qəbul eylə sözüm, olma inadkar,
Səlahi-məsləhətdir, böylə rəftar.
Xəbər göndər ki, sultan də'vət etsin,
Səninlə bir otaqda söhbət etsin.
Ona söylə ki: "Məndə yoxdu təqsir,
Xəyanət baş veribsə, sən müqəssir.
Saraya də'vət etdin Bəxtiyari,
Ələ aldı o da külli ixtiyari.
Görüb azad özün o, canə gəldi.
Səfayi-nəş'əsi tuğyanə gəldi.
Mənə eşqi-məhəbbətdən danışdı.
Vüsalimçün oda yandı, alışdı,
Mənə e'lani-eşq etdi bu oğlan,

---
[1] İnanmaq

Ki, istərdi ola təxtində sultan.
Səni qətlə cəsarət etmiş idi,
Bu qəsd ilə sərayə getmiş idi”.
Vəzirin sözlərindən Gülcəmalın,
Vücudi titrədi, ol xoş xisalın,
Dedi: – Bunlar təmamən iftiradır,
Günahsız bir əsirə nə rəvadır?
Dedi: – Bunca inadə olma mail,
Olarsan Bəxtiyarla sən də zayil.
İnadə uyma sən, gəl olma bədnam,
Nə lazım məhv ola sən tək güləndam.
Nəhayət oldu nail məqsədə ol,
Tapıb o Gülcəmalın qəlbinə yol,
Nə kim, öyrətmiş idi ol sitəmkar,
Gəlib xatun hüzurə etdi ixtar.
“Vəzir dedi ki: – Ey sultani-kamil!”
“Onun qətlində əsla olma qafil!”
“Həqiqət sənə zahir oldu əhval”,
“Nədir qılmaq dəxi təsdiq ehmal?”
“Ona layiq yetişsin qoy cəzayə”
“Ki, ibrət ola hər bir nasəzayə”.
Şərarət eylədi sultanə tə’sir,
Dedi: – Görmək gərək bu yolda tədbir,
Salın zindanə, yatsın qoy son axşam.
Sabah qətli üçün verrəm sərəncam.
Və sultan əmrini edincə itmam,
Günəş batdi və oldu vəxti-axşam.
Onu apardılar zindanə ol dəm,
Yenə bağladılar zəncirə möhkəm.

## BİRİNCİ VƏZİRİN PADŞAHA ƏRZ ETMƏSİ

“Sabah oldu yenə xurşidi-ənvər”.
“Çıxıb, dünya üzü oldu münəvvər”.
Sədası gəldi yenə ol vəzirin,
Yetişdi xidmətinə çün əmirin,

Dedi: ey padşahi aləm-ara!
Haramizadəyə rəhm etmə əsla!
Fəramuş eyləsə kim həqqü ne'mət,
Ədalətdir ona qılmaq siyasət.
Eşitdi çün vəzirin sözlərini
Ziyadə oldu şahin xişmü kini,
Gətirsinlər dedi qıldı işarə,
Qəzəbləndi dedi ol Bəxtiyarə:
– Sənə mən eylədim e'zazü ikram,
Məni sən eylədin rüsvayü bədnam,
Səni etmək gərəkdir parə-parə,
Sənə yoxdur ölümdən özgə çarə.

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-vala!
Sənin olsun pənahın həqq-təala,
Yamanın olmasın ey şahi-kamil,
Sənə olsun səadət cümlə şamil,
"Təhəmmül eyləmək insan işidir",
"Ki, tə'cil eyləmək şeytan işidir".
Deyildi məqsədim, fikrim xəyanət,
Vəlakin boylə oldu mənə qismət.
Görürsən ki, başım cəllad əlində,
Günahsız bir əsirəm yari zində.
Düşündükcə bu hali-zarimi mən,
Keçər biçarə tacir xatirimdən.
Misali-mən muradə yetmədi o,
Cəza aldı, cinayət etmədi o.
– Nə tacirdir? – dedi sultan haman dəm
Onun sən macərasin söylə bir dəm.

## BƏXTİYARIN TACİR MACƏRASINI NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar: ey xanü xaqan!
Əlində daim olsun hökmü fərman,
Var idi Bəsrədə bir varlı tacir,
Ticarət ustası, kirdarlı tacir,
Misirdən mal alar, Hində gedərdi,
Ticarət məqsədilə seyr edərdi.
Yayılmış şöhrəti, olmuşdu məşhur,
Olub sərvət əsiri şəxsi məğrur,
Gecə-gündüz şüarı dövlət idi,
Həmişə fikri-zikri sərvət idi.
Nəhayət zillətə oldu giriftar,
Fənayə getdi dövlət, hər nə kim var.
Fəlakət baş verib hər bir tərəfdən,
Nə kim var malü dövlət çıxdı əldən.
Əlində qalmış idi azca mayə,
Günü oldu mübəddəl ahü vayə.
Alıb çoxlu taxıl verdi paranı,
Töküb ambarə kim, gəlsin zamanı.
Quraqlıq illərində o bazarə,
Aparıb, əldə etsin çoxlu parə.
Vəlakin olmadi məqsudə nail,
Yağış yağdı, taxıl çox oldu hasil.
Bir il də saxladi bəlkə gələn qış,
Ola qıtlıq, bazarda yaxşı satış.
Sonuncu mayə bu sövdadə getdi.
Qalıb ambarda buğda badə getdi.
O bəxti qarə də bir gün səhərdən.
Qılıb tərki-diyar, çıxdı şəhərdən,
Gəmi ilə gəlib Ümmanə düşdü,
Təlatüm başladı, tufanə düşdü.
Çönüb kəşti[1], müsafir cümlə batdı,
Üzüb tacir o dəm bir taxta tapdı.
Dəniz üzrə qalıb bir xeyli müddət,
Gəlib bir sahilə çatdı nəhayət.

Gəzib avarə, çöldə gahü bigah,
Uzaqdan bir imarət gördü nagah.
Yaxın gəldi, nə gördü baqi-cənnət,
Yetişmiş hər tərəfdə nazü ne'mət.
Kəramət əhli idi qoca bağban,
Onu etdi neçə gün bağda mehman.
Soruşdu halını ol mərdi-aqil,
Dedi: vardır bu bağda xeyli hasil,
Nə boldur alması, nari, badamı,
Edir məbhut görən hər bir adamı,
Qalıb bağda, əgər, qılsan nəzarət,
Alarsan xidmət üçün müzd, xəl'ət.
Əlavə, hər biçindən pay alarsan,
Əgər meylin ola qış-yay qalarsan.
Olub razı sözündən bağbanın,
Dedi: – Əlbəttə ollam pasibanın[2].
Edib xidmət o bağda xeyli müddət,
Gəlib çatdıqda bir gün vəxti-qismət[3],
Xəsislik düşkünü, ol qəlbi qarə,
Qılıb diqqətlə məhsulə nəzarə,
– Yəqin qılmaz, – düşündü – kəndli iqrar
Edər bəlkə sözünü sonra inkar.
Mənə lazımdır əlbət gizli ondan
Qılam öz payımı bir yerdə pünhan.
Əgər bağban olarsa əhdə sadiq,
Bölüb qismətimi versə müvafiq,
O dəmdə qaytarıb məhsuli dərhal,
Edim təqdim, qoy olsun bari xoşhal.
Qılıb ətrafa diqqətlə nəzarə,
Yaxın yerdə o tapdı bir məğarə,
Təvəqqüf etmədən ol şəxsi-nadan,
Orada qıldı çoxlu buğda punhan,
Zəmani ki, yetişdi bölgü vaxti,
Qoca bağban gəlib məhsulə baxdi.

---

[1] Gəmi
[2] Keşikçi
[3] Bölüşmək

Sədaqətlə olub əhdində möhkəm,
Edib qismət payını verdi ol dəm.
Görüncə bağbani doğru insan,
Özü-öz fe'linə oldu peşiman.
Açıb, izhar qıldı sirri-razi.
Ki, fe'lindən olalar bəlkə razi.
Və lakin aruzisi verмədi bar,
Qoca bağban qəzəblə etdi rəftar.
Onu rədd etdi bağdan, qovdu getsin,
Gedib öz başına bir çarə etsin.
Pəs ol aşuftəyi, zari, pərişan*
Baş alıb gedər idi dər-biyaban.
Biyabanda pərişan hal getdi,
Gəlib ol dəmdə bir dəryayə yetdi,
Yetişdi, gördü çün bir cəm qəvvas[1],
Oturmuş, eyləmişlər məcmei-xas[2].
Kim olduğunu bildilər təmami.
Durub ona hami verdi səlami.
Olara, ərz qıldı sərgüzəştin,
Güzəşti macəranın şərhi-beytin[3].
Bu qissə onlara çün oldu mə'lum,
Onların bağrı sanki oldu çün mum.
Dedilər: nəsnəmiz[4] yox sənə layiq,
Vəli böylə gəlir əqlə müvafiq.
Dedilər: enəmüz dəryayə bir yol,
Nə gətirsək, sənə bu dəryadə ol.
Qəmu[5] qəvvaslar endi bədərya.
Gətirdi hər biri bir dürri-ziba[6],
Ona gətirdilər on dürri-qəltan[7].

---

[1] Üzgüçülər
[2] Toplanış
[3] İzahatın
[4] Şey
[5] Hamı
[6] Gözəl dürr
[7] Yuvarlaq dürr
[*] Fədainin "Bəxtiyarnamə"si buradan başlayır – *Q.M.*

Görəndə cövhəri[1], qalırdı heyran.
Dedilər: ol cəvani-məhliqayə,
Bunları sat özünçün eylə mayə.
Ki, hər kimsədə yoxdur malü ne'mət,
Cahanda yox onunçun qədrü qiymət.
Olar on dürri-qəltan, ol cəvanə,
Çü verdilər, cavan oldu rəvanə.
Onun əynində var bir köhnə jində[2],
Nihan eylədi onun arasında
Rəvanə oldu, getdi yola doğru,
Pəs ona yoldaş oldu iki oğru.
Başında gördülər yoxdur əmamə,
Geyibdir əyninə, bir köhnə camə[3].
Dedilər: işbu miskin və gədadır,
Təsəlli ver, fəqirü binəvadır.
Onun çün dövləti olmuş nikunsar[4],
Görübən onları fikr etdi qorxar.
Götürüb səkkizin ağzına saldı,
İkisi dürrlərin cibində qaldı.
Qəzara[5] bəxt dönmək oldu mə'lum,
Yerirkən nagahan asqırdı ol şum[6],
Dəhanından dağıldı çünki, dürrlər,
Könül oldu müşəvvəş, cismi tərlər.
Götürdülər o dürrü oğrular pak,
Pəs oldular ona ol dəm qəzəbnak.
Dedilər: hanı bunların qalanı?
Tutuban boğdular o binəvanı.
Çalındı ançi[7] kim san oldu bican
Dəhanından onun yol eylədi qan.
Ayaqdan düşdü mədhuşü[8] heyran,

---

[1] Cəvahirçi
[2] Çırıq, çirkli
[3] Paltar
[4] Dağılmış
[5] Qəflətən
[6] Bədbəxt
[7] Lazımi qədər
[8] Bayılmış

Onu salıb, oradan getdi düzdan[1],
Yetişdi bir mürrüvətli cavanmərd,
Baxıb gördü, əsər qıldı ona dərd.
Alıb arxasına apardı şəhrə,
Dedi: haqdan görüm mən xeyli bəhrə.
Özünə gəldi ol bərgəştə dövlət[2],
Tamam ə'zası məcruhu cərahət[3].
Pərişan, müztərib, məcruh, xəstə,
Fələk çövründən olmuş dilşikəstə.
Cahan gözlərinə olmuş qaranqu,
Nəsib olmuş ona ənduhü-qeyqu[4].
Pəs ol igid onu əzbəhri mə'bud[5],
Neçə gün saxladı, çün oldu behbud[6]
Yerində gördü qalmış iki cövhər,
Yenə oldu damağı tazəvü, tər.
Dedi mən bunları əzbəhri tuşə[7],
Aparım, satayım, cövhər füruşə.
Rəvanə oldu, getdi suyi-bazar[8],
Dedi sərrafə: sən varsan xəridar?
Əgər sən alır isən ey bəradər
Sataram, məndə vardır iki cövhər.
Görüb ol dəmdə onu, dedi sərraf:
– Nə verim, söylə gəl əzruyi[9] insaf.
Yeriyib ol dəm, ol biçarə, miskin
Bilirdi ərzişin[10], dedi bahasın.
Dedi öz-özünə sərrafi-nadan:
"Bilir qiymətini, verməz bu ərzan.
Bu məbləğ mən buna verincə qiymət,

---

[1] Oğrular
[2] Var-yox əldən getmiş
[3] Yaralanmış
[4] Dərd-qəm
[5] Allah xatirinə
[6] Sağaldı
[7] Azuqə almaq üçün
[8] Bazara tərəf
[9] Üzündən
[10] Qiymətin

Qılayım mən buna böhtanü töhmət!”.
Pəs ol dəm eylədi fəryadü əfğan.
Eşidib hər tərəfdən gəldi xəlqan[1].
Dedilər: noldu sənə, söylə doğru?
Dedi: çox malımı almışdı oğru,
Həlal idi vəlakin, çinki malim
Əlində gördüm üşbu düzdi[2] zalim.
Tutuban ona ənva'i siyasət
Qılar azarü cövri-binəhayət,
Apardılar onu nalan və giryan[3]
Bənəvdi padşahi əsrü dövran.
Dedi sərraf ki, ey şahi cahandar!
Ki, məndə var idi on dürri-şəhvar.
İkisin bu kişi məndən nihani
Oğurlamış idi, mən tapdım ani.
Səkkiz bu ikidən vardır tamaşa,
Hamı bir-birinə həmcins, həmta.
Gətirib tutdular çünki bərabər,
Qəzara hamısı bir-birə bənzər.
Dedi sultan: bu kişi oğru oldu,
Bu sərrafın nişanı doğru oldu.
Nə lazımdır buna, zəncirü-zindan,
Aparın bunu asın boğazından!
Könül qəmli, əli bağlı, giriftar
Çəkib apardılar, çün canibi dar.
Olub məcmu, mərdum, amü həm xas
Qəzara etdi ol dəm cəm' qəvvas.
Baxıb gördülər ol dəm, ol fəqiri,
Qalıbdır mübtəla, yox dəstigiri.
Əli bağlı, qızıl qan içrə qəltan,
Həqqə yalvarır, eylər ahü-əfqan.
Yetişdilər ona çün ol cəmaət
Əda qıldılar, əxbari şəhadət.
– Ki, ey xəlqi cahan ümmidgahi,

[1] Adamlar
[2] Oğru
[3] Ağlaya-ağlaya

Hamı biçarələr püştü-pənahi.
Günahi yoxdur, ol sərgəştə heyran
Qılıbdır ona ol sərraf böhtan.
Bizə çün zahir olmuşdur həqiqət,
Olur vacib kim ondan ərzi-xidmət.
O miskinin sərasər sərgüzəştin
Şaha ərz eylədilər, şərhi beytin.
Buyurdu padşah misgin rahət,
Pəs ol sərrafə tədbirü-siyasət.
Siyasət etdilər çün ona büsyar.
Özü öz fe'linə oldu giriftar:
– Nə ki, mən söylədim, məhz xətadır,
Sözüm böhtan idi, üzüm qaradır.
Qılırdı naləvü zarü fəqani
Ağac altında ol tapşırdı cani.
Çü təslim eylədi sərraf canin,
Gədayə verdi onun xanimanin.
Gər istərsən sənə yetməyə nöqsan,
Cahanda heç kimə söyləmə böhtan!
Demə böhtan və töhmət bigünahə,
Düşər hər kimsə öz qazdığı çahə[1].
Gədayə eylədi e'zazü hörmət.
Bağışladı ona çox malü ne'mət.
Qılırdı gecə-gündüz xidmət, əzcan[2]
Ki, ta oldu xəzinadari-sultan.
Kilidü[3] qüflü[4] sənduqü[5] xəzinə
Hamısın verdi şah onun əlinə.
Kilid əlində gördü şadu xürrəm
Bəli olmuş kilid əndək ucu xəm[6],
Qəzara bəxtü dövlət olmadı yar.
Kilidi qoydu çün bərruyi[7] divar.

[1] Quyu
[2] Can-başla
[3] Açar
[4] Qıfıl
[5] Sandıq
[6] Ucu bir balaca əyilmişdir
[7] Üzərinə

Döyər daş ilə möhkəm ol kilidi,
“Düz eləyim bu əyrisin mən indi”.
O zərbətdən olub surax[8] divar,
Döyərdi başına əfqan edib, zar.
Edərdi ahu-vaveyla və fəryad,
Qılardı bəxt əlindən dadü bidad.
Bu sözdən gər ola sultan xəbərdar,
Davasız dərdə mən ollam giriftar.
Nöşün bundan əgər qılsa nəzarə,
Hərəm yolu görünüb aşikarə.
Rəvan ol bisəadət, dövləti kəm,
Götürdü palçıq ilə qıldı möhkəm.
Qəzara gördü şahın bir qulami,
Şaha ərz etdi əhvali tamami.
Ki: şaha ol xəzinədar küstax,
Hərəm sarı olan divari surax
Qılıbdır ta edə ondan nəzarə,
Rəvadır qılmaq onu parə-parə.
Eşitdi padşah oldu rəvani:
Baxıb təhqiq gördü ol nişani.
Ona qəhr eyləyib oldu qəzəbnak,
Dedi: ol dəm ki, ey mərdudi-napak.
Sənə mən tapşırım cümlə xəzain
Olasan sən mənə bədxahü xain?
Sənə tənbeh edim mən qala təmsil
Buyurdu gözlərinə çəkdilər mil.
Pəs ol biçarə etdi ahü fəryad,
Qılırdı bəxt əlindən dadü bidad.
Açıb ağzın dedi ol padşahə,
– Eşit ərzim mənim tək bipənahə,
Mənim yox, haq bilir mütləq günahim,
Vəlakin taleü bəxti-siyahim,
Məni uğratdı, çox dərdü bəlayə,
Bəla verdi məni axır fənayə.
Qılırdı nalə ol ahü fəqani,
Rəvan tapşırdı ol biçarə cani.

[1] Deşik

Fədai, hər kimə bəxt olmaya yar,
Nə hasil çox tərəddüd, sə'yü büsyar.
Dedi bəs Bəxtiyar: ey şahi-dövran,
Sənə dövlət müyəssər əmrü fərman
Bu gün çün döndü dövlət, bəxtü iqbal,
Mənim əhvalıma bu qissə timsal.
Bu sözlər ta olunca xətm, itmam,
Pəs ol dəm batdı gün, çün oldu axşam.
Dedi sultan kim, oldu vəxti-bigah.
Aparın saxlayın, olsun səhərgah.
Buna mən edəlim öylə siyasət,
Ki, hər bibakə ola pəndü ibrət.

## İKİNCİ VƏZİRİN GƏLİB PADŞAHA ŞİKAYƏT ETMƏSİ

Səhər çün sübh sadiq aşikarə,
Görünməz oldu göylərdə sitarə[1],
Var idi padşahın bir vəziri:
Ki, onun yox fəsahətdə[2] nəziri.
Deməzdi xeyr, ol bədruy, bədxah[3],
Gəlib sultan yanına çəkdi bir ah.
Müəyyən bir həyasız, adı Bəhruz,
Sanarsan səpdi şahın zəxminə[4] duz,
Dedi ol dəm driqa, heyf əfsus!
Dəxi qalmadı bizdə nəngü[5] namus?
Şəha! Öldürginən bu Bəxtiyari!
Bu bədbəxtü xəsisü bivüqari.
Neçə bu dürrüdür, sözü tükənməz,
Bu ölməzsə səni kimsə bəyənməz.
Bu növü çox dedi Bəhruz çəndan,

[1] Ulduz
[2] Gözəl danışmaq
[3] Böhtançı
[4] Yarasına
[5] Utanmaq

Ki, döndü qeyrətindən oda sultan.
Tükəndi taqətü, səbrü qərari,
Buyurdu: hazır edin Bəxtiyari!
Dedi sultan: kim ey mərdud[1] dərgah!
Ki, haqdır duz əkmək, ol gəl agah!
Dedi: bilirmisən bu nə deməkdir?
Giriftar eləyən nanü nəməkdir![2]
Səni bu dərdə saldı çərxi-dövran,
Kim, ona yox, olunmaz heç dərman,

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi sərvər!
Həmişə dövlətin bada[3] müyəssər.
Müsəlləm sənə tacü təxti-şahi,
Müqərrər ola əzməh, ta bəmahi[4].
Neginin[5] ola çün nəxşi Süleyman.
Müti olsun sənə divan[6] və insan.
Ki, səbr eylər hər işdə aqil olan,
Ki, səbr eyləməyən olur peşiman.
Ki, səbr edən yetər axır muradə,
Qalır bisəbr sərgərdan aradə.
Əgər səbr eyləyeydi ol bazırgan[7],
Nöşün fe'lindən olurdu pəşiman?
Şitab[8] eylədi, düşdü cüstücuyə[9],
İki oğlun onunçün saldı suyə.

---
[1] Qovulmuş
[2] Duz-çörək
[3] Olsun
[4] Göylərədək
[5] Üzük qaşı
[6] Divlər
[7] Tacir
[8] Tələsmək
[9] Axtarış

## XACƏ HƏSƏN BAZIRGANIN HEKAYƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi sərvər!
Həmişə dövlətin bada müyəssər!
Eşitdim ravilərdən[1] bir rəvayət,
Əcəb şirin, mütəvvəl[2] bir hekayət
Məgər var idi bir mərdi-tavana,
Bəqayət[4] maldarü, sərvü bala.
Bəsi münəm[5], bəsi varlı, Həsən nam[6].
Səmənbuyü[7] nikuruy[8], güləndam.
Həmişə xürrəm, xoşnudü xursənd.
Könüldə həsrəti yox, qeyri fərzənd[9].
Könüldə müttəsil oğul xəyalı,
Təsəddüq eylədi çox mülkü malı.
Fəqirə, binəvayə, dərdməndə...
Kənizin eylədi azad-bəndə...
Düzəltdi yol, körpü qıldı bünyad,
Bəqaül-xeyr[10] qıldı məscid abad,
Yetirdi çünki nəzrin müstəhəqqə,
Hamı oldu qəbul dərgahi-həqqə,
Pəs ol dəm, hamilə oldu əyali,
Büründü başinə sövda[11] xəyali.
Götürdü çox mətaü barixanə[12]
Ticarət əzminə oldu rəvanə.
Zərü-simü[13], məta binəhayət

---

[1] Nağıl danışanlardan
[2] Uzun
[3] Varlı kişi
[4] Son dərəcə
[5] Çox nemətli
[6] Adı Həsən
[7] Çiçək qoxulu
[8] Yaxşı üzlü
[9] Övlad
[10] Xeyirli yadigar
[11] Ticarət
[12] Yük
[13] Qızıl-gümüş

Belə götürdü ol sahib-dəyanət.
Qamu[1] fikrin görübən yola düşdü,
Varıb bir mötəbər şəhrə yetişdi.
Mürəsse danələr[2], firuzə, mərcan,
Neçə yaqut ilə ləli-Bədəxşan!
Bəsi simü zəru zərbəfti-diba[3]
Əcayib töhfələr qılmış mühəyya.
Apardı pişkəş ol padşahə,
Götürdü əl dualar qıldı şahə,
Ki: şaha, dövlətin olsun müxəlləd[4].
Bəqai dövlətin olsun da payənd[5].
Həmişə düşməni mənkub[6] və məqhur[7],
Pərişan xatir olsun zarü rəncur[8].
Ziçövri-hadisat[9], zülmi bədxah,
Pənahında səni saxlasın Allah.
Bu növ eylədi çox mədhxanlıq
Şəh ona qıldı lütfü mehribanlıq.
Ona yer göstərib, pəs qıldı hörmət,
Ona başdan-ayağa verdi xələt.
Dedi: – Sənsən nədimim həm vəkilim,
Bu gündən belə sən ol həmnişinim.
Hər işdə sənə verdim ixtiyarım,
Ki, sənsiz yox mənim səbrü qərarım.
Neçə il qaldı orda ol xirədmənd[10]
Vəlakin canü dil müştaqi-fərzənd[11]
Götürdü ol zaman çox sim[12], çox mal
Yazıb bir namə evə qıldı irsal:

---

[1] Hamı
[2] Naxışlı, daş-qaş
[3] Gözəl
[4] Daimi, əbədi
[5] Daimi
[6] Döyülmüş
[7] Qəzəbə gəlmiş
[8] İncimiş
[9] Hadisələrin zəhmətindən
[10] Ağıllı adam
[11] Övlad arzusunda olan
[12] Gümüş

"Bizə lütf etdi şah əmhəmdülillah,
Qılıbdır çün bizi məqbuli-dərgah[1].
Olular mütəəssil məclisdə həmdəm,
Ola bilməm cida[2] bir ləhzə, bir dəm.
Nolur bizə yazasız bir kitabət.
Nə keçmiş hali-əhvali, səlamət,
Nəyizi[3] sən zinhar, əlbəttə, zinhar,
Necədir halınız? edin xəbərdar!".
Yetişdi namə, övrət oldu dilşad,
Həqqə şükr etdi, qəmdən oldu azad.
Nigari-nazənin, gülbərgi-nəsrin[4],
Pəs ol dəm eylədi bir kimsə təyin.
Kitabət yazdı ol sərvü güləndam.
Cavab ol əlinə pəs qıldı elam,
"Ki: ey Fərxəndə tale, ol gəl agah!
Bizimçün yoxdur çox təşvişü ikrah.
Vəli səndən yana hər gecə-gündüz,
Çəkərdik hər zaman ahi-ciyərsuz
Bihəmdullah bizə qıldın işarət,
Şirin camın bu sözünə bəşarət.
Sənə mən verəlim bir müjdəgani[5],
Nişat əfza çi ömrü zindəgani.
Ki, bari-həmlidən[6] məndən nişanə,
Var idi sən səfər qıldın, zixanə[7].
Təmam oldu, çi keçdi vəxtü saət.
Sənə, mənə xuda qıldı şəfaət.
Əta qıldı bizə həqq iki oğlan,
Ki, hər birisi bir xurşidi-taban.
Necə ola dedim iqbalü bəxti,
Münəccim rəmlü üstürlabə[8] baxdi.

---

[1] Sarayın yaxın adamı
[2] Ayrı
[3] Nəyiniz – demək istəyir
[4] Nəstərən çiçəyinin yarpağı
[5] Muşduluq
[6] Hamiləlik yükündən
[7] Evdən
[8] Rəml aləti

Dedi: sən olgilən xoşnud xürsənd[1],
Ki, belə hökm edibdir ol xudavənd,
Birisi ol şəhanşahi-cahangir,
Bəqayət sahibi təmkinü tədbir,
Birisi həm olub məqbuli dərgah,
Gecə-gündüz həmişə məhrəmi-şah.
Vəlakin vardır onların qərani[2],
O dəryanın belə gəlir nişani.
İkisi dəxi dəryayə olur qərq,
Ölə, ya qala, onu bilməzəm fərq.
Əgər qurtardılar ol vərtədən[3] can,
Müyəssər dövlət olar sənə asan.
Onu dedim ki, olur həmdəmi-şah.
Ona həm yüz verir, həm möhnətü ah.
Olur bir töhmətə ol həm giriftar,
Vali olur ona həm dövləti yar.
Ona zahir çox əhvalü əcayib,
Düçar olar yenə əla məratib[4],
Bizim əhvalımız xoş, şükr billah,
Səlamət, afiyət, əlhəmdülillah.
Pərişan xatirik, sənsiz bəqayət,
Sən əskik eyləmə bizdən inayət!".
Bunu yazdı rəvanə qıldı namə.
Apardı qasid ol verdi cəvanə,
Eşitdi bu bişarət çünki Xacə,
Onun gözünə gündüz oldu gecə.
Dedi: – ey padşahi-dinü dünya,
Müdam olsun sənə dövlət mühəyya!
Kərəm qıl, istərəm ver mənə rüxsət.
Ki, yaxdı bağrımı hicranü firqət.
Buna şah vermədi heç bab dəstur[5],
Fəraq oduna yandı zarü məhcur,

---

[1] Şad ol, sevin
[2] Tale
[3] Bəladan
[4] Böyük mənsəbə çatar
[5] Göstəriş

Şitab etdi necə kim qıldı təcil.
Gedə bilmədi Xacə qaldı on il,
Yenə yazdı evinə bir kitabət,
Fəraqü hicr əlindən çox şikayət.
“Ki: ey arami-can, məqsud, mətlub!
Ki, siz Yusif mənəm qəm-didə Yaqub!
Kəsildi mütləqa səbrü qərarım,
Vəli yoxdur əlimdə ixtiyarım.
Dəxi qalmadı məndə səbrü taqət,
Şahə ərz eylədim, vermədi rüxsət.
Yola düşüb gəlin siz iki qardaş,
Ananızı götürün belə yoldaş!”.
Yazıb bu naməni çün etdi elam.
Özü qaldı bəsç bisəbrü aram.
Rəvan ol dəmdə çün yetdi namə,
Çü bildi məzmunun banuyi-xanə[1],
Həman dəm durdu o xatuni-rəna[2]
Səfər əsbabini qıldı mühəyya,
İki oğlun belə götürdü filhal,
Dəxi heç qalmadı təqsirü ehmal.
Gəlirdi şah yanına Xacə hər ruz,
Ki, nagah çəkdi bir ahi-cigərsuz[3].
Rəvan olmuş gözündən əşki-həsrət[4],
Könüldə qalmamış aramü taqət.
Çü sultan eylədi ona nəzarə,
Sanasan bağrı oldu parə-parə,
Dedi: Xacə, nədəndir bu məlalın?
Neşə oldu digərgun[5] belə halın?
Dedi sultanə: kim ey padişahim!
Başımın yiyəsi, ümmidgahim,
Kimin könlündə var hicrani fərzənd,
Olur zəhri hilahil[6], gər yesə qənd.

---

[1] Evin xanımı
[2] Gözəl arvad
[3] Ciyər yandırıcı
[4] Həsrət yaşı
[5] Başqa cür
[6] Acı, zəhər

Oğul yüzünə baxa kimsə bir dəm,
Şükoftə xatir[1] ola şadü xürrəm.
On ildir ey xudavəndi-yeganə,
Oğul görməmişəm mən əhli-xanə,
Rəvanə eylədim, namə olarə,
Ki, olar həm gələlər bu diyarə.
Gözüm yolda qalıbdır, gəlməz onlar.
Nəsib oldu mənə ahü fəqanlar!
Dedi sultan mənimlə beyət et sən!
Yenə tez gələsən, əylənmiyəsən.
Qəsəm yad etdi, and içdi və möhkəm,
Ona verdi icazət, şah dərdəm.
Rəvanə oldu, yola düşdü Xacə,
Həqqin təqdirini gör oldu necə?
Sürüb yetişdi bir dərya kənarə,
Dedi mən neyləyim bu dərdə çarə?
Var idi onda çox məllahi-gəşti[2];
Gəmiyə oturub dəryanı keçdi.
Dedi məllah[3] ona: "Ey mərdi-huşyar!
Bu yerdə oğru var, gəl ol xəbərdar,
Ki, kim bunda yatar, ya yuxu eylər,
Aparıb malını başın kəsərlər!".
Eşitdi bu sözü ol mərdi-miskin,
Düşüb qorxu canına oldu qəmgin.
Qəzara ol tərəfdən, ol səmənbər,
İki oğlu belə sərvü sənubər,
Batan gün vaxtı, keçmişdi şəbi-tar,
Dərya qırağına yetişdi şəbi-tar.
Dərya qırağına yetişdi onlar,
Dedi oğlanlara banuyi-xanə:
– Gecə olur məgər gəşti rəvanə?
Gəzin siz, daxil olmun, cani-madər!
Məbadə qalasız biçarə, müztər,
Olasız ta məgər huşyarü didar.

---

[1] Qəmgin
[2] Gəmi-gəmiçi
[3] Gəmiçi

Gəmi yola düşəndə siz xəbərdar.
Girib gəmiyə dəryanı keçəlim!
Bu uzaq yolu şayəd[1] tey edəlim!
Eşidib bu sözü ol iki rəna:
Gedərlər gahi zirü gah bala.
Məgər ol Xacə həm, əz tərsi-duzdan[2],
Başı altında qoymuş dürri-həmyan[3].
Sərasimə ayılıb yuxusundan,
Qırağa gətirib salmış nühani,
Pəs ol dəm eylədi ahu fəqani:
"– İki oğru budur apardı malım,
Müsəlmanlar, pərişan oldu halım!".
Pəs ol dəm qopdu hay-huy, hey tut!
Tutub bağladılar onları məzbut[4].
Onun əlində oldular giriftar,
Döyüb, söyüb oları, onlar ağlar:
Bəsi cövr eyləyib, olardan istər,
Yükəş ləlü cəvahir, bədrəyi-zər.
Dedi olar ki, ey mərdi müsəlman!
Utan həqdən, bizə sən qılma böhtan!
Dedi: verin malım, mən yoxsa tezrək,
Ataram dəryaya mən sizi bişək.
Necə kim, qıldılar fəryadü əfqan,
Qəbul eyləmədi ol mərdi-nadan!
Qabaqları yığıb qaşları çatdı[5],
Gətirib onları dəryaya atdı.
Könüldə rəhm yox, ol bimürüvvət,
Özü özünə qıldı zülmü şiddət.
Mürüvvətsiz kişidə olmaz iman,
Olur felindən axir ol peşiman.
Əlindən gəldiyin sən etmə zinhar,
Pəşimanlıq çəkərsən, axiri-kar!

[1] Bəlkə
[2] Oğruların qorxusundan
[3] Pul kisəsi
[4] Zəbt etmək
[5] Qaş-qabağını çatdı

Sənə çün qalib oldu hirsi-şeytan,
Özün saxla, çəkərsən sən peşiman!
Vəlakin hər kimə həqq olsa qəmxar,
Ona yetişməyə heç gunə[1] azar.
Kimə kim, yar olsa həqq-təala,
Onu qərq eyləməz ol abi-dərya[2].
Nəzər qıl sən, gəl ol iqbalü bəxtə,
Olara doğru gəldi iki təxtə,
Pəs ol dəm zarü qəmgin, dil-şikəstə,
Hərəsi oturub bir təxtə üstə,
Cida[3] düşdü biri-birindən onlar,
İkisi dəxi firqətdən dil-əfkar[4].
Olan çün getdi, ol biçarə anə,
Bəlavü möhnətə oldu nişanə,
Baxıb hər dəm çəkərdi intizari,
Kəsildi səbrü aramü qərari.
Sabah olunca, ol biçarə övrət,
Çəkərdi hər zaman yüz ahi-həsrət.
Vəlakin çün vəxti-səhərgah,
Ol övrət dadi-bidad eylədi ah!
Saçın yoldu, üzünə çaldı dırnaq,
Sovurdu başına çox daşü torpaq.
Xüruşi nalə, yüz növhə, fəryad,
Deyərdi eyləyib əfqanü fəryad.
– Mənim tək zarü giryan varmı, ola?
Mənim tək bidilü can varmı, ola?
Düşüb bülbül kimi ayrı gülündən,
Ciyər guşələrim getdi əlimdən.
Bu halə necə səbr eyləsin ana?
Qalıb firqət oduna yana-yana.
Məni yaxdı fəraqü nari-hicran[5].
Bu dərdə varmı ola hiç dərman?

---

[1] Cür
[2] Dəniz suyu
[3] Ayrı
[4] Ürəyi qəmgin
[5] Ayrılıq atəşi

Məni dərd aldı, dərman getdi əldən,
Yan ey canim ki, canan getdi əldən.
Məni saldı fələk onlardan ayru,
Cidalıq qıldı qarə bağrımı su.
Qılıb rəxtü libasın parə-parə,
Deyər bu dərdə yox dərmanü çarə.
Yetərdi hər kimə eylərdi ilhah[1],
Xəbər verdi ona ol dəmdə məllah.
Eşidib bu sözü çün getdi huşi,
Yenə başladı bu növhə xruşi[2]
Qılırdı hər zaman yüz növhə bünyad,
Keçən günlərini eylərdi həm yad.
O iki qönçeyi-baqi-lətafət,
Açılmadı, olara yetdi firqət,
On ildi olara atası müştaq,
Yetirəydim ona mən onlari sağ.
Atasına aparım mən olari,
Ki, şayəd şad edim ol dilfikari.
Nə yüznən mən daxi oraya varım?
Necə baxım üzünə, şərməsarim!
Driğa bəxti-tale olmadı yar,
Dəvasız dərdə oldum mən giriftar.
Atası yanına mən iki şəhbaz[3],
Aparırdım əlimdən qıldı pərvaz.
Hərəsi getdi bir dərya kənarə,
Məni saldı həzaran[4] ahü zarə.
Fəqanü növhə edərdi o xatun,
Bu sözləri eşitdi ol ciyərxun.
Başından getdi ağlı, oldu bihuş,
Özünü eylədi mütləq fəramüş.
Sanasan cani yox, getmişdi mütləq,
Özünə gəldi çün ol mərdi-əhməq.
Tanıdı övrətin, gördü iraqdan,
Sanasan gözdən oldu, həm qulaqdan.

---

[1] Təkid etmək
[2] Ağlayıb zarıldamaq
[3] Laçın
[4] Minlərcə

Vurub başə dedi: ahü vaveyla,
Kim ola mən təki bədnamü rüsva.
Gəl ey övrət, bu gün gör neylədim mən?
Özüm öz başıma kül eylədim mən.
Sanasan mən dəli oldum, qorxdum,
Özüm öz ayağıma tişə vurdum.
Varıb mən kimə edim dadü bidad,
Özüm özümə etdim zülmü-bidad.
Belim, arxam qamu xurd[1] oldu, sındı,
Nə sud[2] eylər peşiman olmaq indi.
Keçən işi qılarmı qeyqu behbud?
Pəşiman olmaq olmaz kişiyə sud.
Qalır canda vəli yüz ahu həsrət.
Tükənməz dərdü qəm, ənduhü[3] möhnət.
Xəbər al indi o biçarələrdən:
Ata zülm eyləmiş avarələrdən.
İkisi bir-birindən oldu ayru,
İkisinin dəxi könlündə qeyqu.
Apardı kuçikin çün mövci dərya,
Qırağa düşdü ol gül bərgi rəna,
Həqqə bağlamışdı sidqi-ixlas,
Orada tapdı onu cəmi qəvvas.
Qamusu oldular xoşhal, xoşnud,
Dedilər eyləyübən şükri məbud.
Biz istərdik bu bəhr[4] içində gövhər,
Nə gövhərdir ki, ola bundan yektər[5].
Böyük oğlan ilə ol çubi-parə[6]
Çıxardı mövc bir dərya kənarə.
Qəzara ol diyarın padşahi,
Biləsincə[7] qamu xeyli sühapi[8],
Ova çıxmışdı seyrü tamaşa,

[1] Parçalandı
[2] Xeyir, nəf
[3] Qüssə
[4] Dəniz
[5] Əla
[6] Taxta parçası
[7] Arxasınca
[8] Qohunu

Yetişdi bir cavanə sərvü bala,
Baxıb gördü ki, bir pakizə oğlan
Qalıbdır arada, nalanü giryan.
Mələksima və bir xurşidi-mənzər[1],
Cavanü nazənin fəxrəndə əxtər[2],
Gözü nərgis, yüzü gülbərgi xəndan,
Xəcil hüsnündən onun mahi-taban,
Cəmali dilfərib[3], qəddi şümşad,
Görən bir gəz yüzün, qəmdən olur şad.
Apardı onu dərdəm şəhriyarə,
Çü sultan eylədi ona nəzarə.
Başından getdi əqli, oldu heyran,
Xəbərləşdi, dedi: əhvalin oğlan?
Varidi çün onun başında dövlət,
Ona həm yar idi, bəxtü səadət.
Pəs ol dəm padşahi-dadgüstər[4],
Buyurdu gəlsin ol əvani-ləşgər[5],
Vəzirü həm vəkilü, əhli-divan.
Çü hazır oldular, buyurdu sultan:
– Mənimçün sonra yoxdur məndə fərzənd,
Necə olur genə fikr eylərəm mən,
Bu oğlandan bəsi asari dövlət,
Görünür yenə çox həm şanü şövkət.
Səlah olursa, ey əşrafü əyan!
Mənə olsun oğul, sizə bu sultan.
Dedilər: qəbul etdik, ey xirədmənd[6],
Hamu biz bəndəyik, sənsən xudavənd.
Kimə oğlum deyər olursa sultan,
Qılalım cani-baş yolunda qurban.
Olalım cani-dildən biz duagu,
Daxi çəkməyəlim ənduhü qeyqu,
Riza verdi hamı ərkani-dövlət,

---

[1] Günəş simalı
[2] Ulduz
[3] Ürək çalan
[4] Ədalətli
[5] Qoşun başçıları
[6] Ağıllı

Buyurdu şah olara gəldi xələt,
Döyüldü təblü kusu[1] şadyanə,
Köçübən şəhrə oldular rəvanə.
Şah ol oğlanə verdi tacü təxti,
Onunçün yar idi iqbalü bəxti.
Nəginü[2], möhri-sultan[3], həm ona şah,
Verib öz əliylə, etdi[4] şahənşah,
Əl əl üstə qoyuban sərfikəndə[5],
Ona əşrafü əyan oldu bəndə.
Döyüldü təblü kusü həm nağarə,
Nida qıldı münadi[6] aşikarə,
– Xəlayıq, siz bilin təhqiqü yəqin,
Ki, şahın var idi bir oğlu gizlin.
Bu gün şah ona verdi ixtiyari,
Nəginü, tacü, təxti, külli vari,
Oturdu padşah təxtinə oğlan,
Ona ərkani-dövlət oldu fərman.
Ona həqq eylədi, öylə inayət,
Eşit ol kiçik oğlandan hekayət.
Xəbərdar ol, eşit, olma gümanda!
Deyər ravi məgər kim ol zamanda
Ata çün oları atmışdı suya,
Xəbərdar oldu düşdü cüstücuya[7],
Ər-övrət həm ikisi belə ağlar,
Tərəddüd edib oldular tələbkar.
Olari aradılar, müddəti çənd,
Ələ girmədi fərzandani[8] dilbənd.
Oların ahına daş oldu çün mum,
Gəlib əyləndilər məhrum və məqmum[9].

---

[1] Nağara
[2] Üzük
[3] Padşahlıq möhrü
[4] Ayıtdı – dedi
[5] Başı aşağı
[6] Carçı
[7] Axtarış
[8] Uşaqlar, övladlar
[9] Qəmgin

Dedi övrət ki, görməm səndə təqsir,
Yox imiş, nedəlim təqdirə tədbir.
Dedi Xacə: mənə irdi məlalım,
Bu firqətdən pərişan oldu halım.
Məgər rəf eyləyəlim bu məlali,
Özüm özümə qıldım bu xəyali,
Girim bu kəştiyə, bixof və ikrah[1],
Gəzim dərya üzündə gahü-bigah,
Rəvan edim bu dəryayə gəmini,
Ki, şayəd[2] tapım onların leşini.
Ki, dərya etməyə nabud, naçiz,
Oları edəlim təkfin[3] və təchiz.
Deyərlər ölü özü kim olur sərd,
Görəndən çün mənimçün səhl olur dərd.
Rəvanə oldu dəryayə bəixlas[4],
Yetişdi gördü çün bir cəmi qəvvas.
Olubdur əradə hamısı cəm,
Olar ilə bir oğlan var ki, çün şəm.
Cəmali sanasan xurşidi-ənvər[5]
Sözü şəkkər, boyu sərvü sənubər.
Gözü nərkəs, qaşı yay, tir müjgan[6],
Dişi dürr, ləbləri ləli-Bədəxşan,
Yüzündə xali mişkin danə-danə,
Biri qəsd eyləmiş yüz dadlı canə,
Orada gördü xacə, ol cavanı,
Sanasan yanar oda düşdü canı.
Yetişdi onlara kim dedi: ey can!
Nə yerlidir mənə de, sən bu oğlan?
Dedilər: "Ey xridməndi-güzidə!
Bu oğlandır qulami zər-xəridə[7]".

---

[1] Qorxub çəkinmədən
[2] Bəlkə
[3] Kəfənləmək
[4] Xilas etmək üçün
[5] İşıqlı günəş
[6] Kirpikləri ox
[7] Qızıl ilə alınmış

Dedi: əgər satarsız bu qulami,
Bahasın verəlim indi tamami.
Pəs ol dəm oğlana oldu xiridar,
Olarə verdi qiymət zər və dinar.
Satın aldı çü xacə ol cavani,
Dedi: ey can, ömri-zindəgani!
Gecə-gündüz işim təşviş idi, ah!
Sənə uğradım, indi həmdülillah!*
Mənimçün hər işimdə yar olarsan,
Ağır dəmdə mənə qəmxar olarsan.
Olub həmrah Xacə ol cəvanə,
Yol alıb getdilər bərsuyi-xanə.
Çatıb, birdəm çağırdı övrətini,
Qılıb tərif cavanın xislətini,
Dedi Xacə: gözün aydın, ay arvad!
Mən aldım bu qulami bizə imdad,
Edər xidmət bizə hər bir zamanda
Bu yerdə, ya ki, başqa bir məkanda.
Görüncə oğlanı övrət dayandı,
Vücudi titrəyib, odlara yandı.
Çəkib nərə yıxıldı, oldu bihuş,
Sanasan söndü fanus, oldu xamuş.
Gəlincə huşə, Xacə sordu ondan,
– Səbəb noldu sənə, oldun pərişan?
Dedi övrət: – Məgər sən bixəbərsən?
Bu övladdır sənə, sən də pədərsən.
Qovuşdu bir-birə onlar haman dəm,
Ağır həsrətdən ayrı, şadü xürrəm.
Ata gördü oğulda şövqü sənət.
Ona təlimi qıldı həm ticarət,
Alıb çoxlu cəvahir tacir oldu,
Ticarət məqsədinə azim oldu.
Gəlib çatdı haman bir başqa şəhrə
Ki, bəlkə bu səfərdən gördü bəhrə.
Nə bilsin ki, bu mülkün padşahi,

---

* Poemanın əslində itmiş vərəqi burasıdır – *Q.M.*

Onun öz qardaşıdır, yox guvahi.
Hüzuri-şahə tacir oldu dəvət
Edib təqdim ona çox malü dövlət,
Dürrü əlmasü yaqut, dürlü gövhər,
Zümrüd, kəhrəba, mirvari, cövhər.
Qılıb tərifü tövsif öz matahin,
Qazandı hörmətin ol padişahin.
Dedi: malü matahin xeyli zəngin,
Xridar olmamaqsa qeyri-mümkün.
Vəlakin sözlərin qiymətli incu,
Bizi heyran qılıb ey mərdi-xoşgu.
Gözəldir söhbətin, şirin məqalin,
Sözündən bəllidir halin, xisalin.
İradəm var səninlə qardaş olmaq,
Sədaqət məqsədilə sirdaş olmaq.
Qəbul etsən sözüm, burda qalarsan,
Saray içrə mənə həmdəm olarsan.
Qəbulə keçdi söhbət tutdu çün baş,
İki qardaş, yenidən oldu qardaş.
Xəbərsiz bir-birindən olmub agah,
Edib sevda, biri tacir, biri şah.
Meyü badə ilə məclis əhatə,
Günü sərf etdilər eyşu-nişatə.
Şərabın təsirindən şah sərxoş,
Yıxıldı rəxtixabə oldu bihuş,
Kiçik qardaş görüb hali bu münval,
Çəkib şəmşir, ayağa qalxdı dərhal.
Ki, şahə dəyməsin heç bir xəsarət,
Ona çəksin keşik ol bacəsarət.
Durub taxtı başında, əldə şəmşir
Xəyali xeyrikən, baş verdi təqsir.
Gəlib əhli-saray, oldu guvahi
Dedilər: “Qətl edirmiş padşahi!”.
Ayıldı xabi-işrətdən ki, sultan,
Sorub ovzai, qaldı matü heyran.
Buyurdu şah dərdəm gəldi cəllad
O tacir yalvarıbən qıldı fəryad.

Dedi oğlan ona: – Ey padşahim!
Bu dəvadə mənim yoxdur günahim.
Şaha qəsd etməmişəm, bigünahəm,
Qələt fikr etmə ki, mən rusiyahəm[1],
Dedim olmuya, nagah, gələ bədxah,
Bu halə ta olunca bəndə agah,
Qılıb öz halimə bir fikrü tədbir
Əlimdə bari hazır ola şəmşir.
Mənim yoxidi, bir özgə xəyalim,
Dönüb tale pərişan oldu halim.
Dedi ol dəmdə yetdi halə düşmən,
Təqafül eyləmə, öldür məni sən.
Dedi sultan: bu söz ki, buna həqdir,
Əgər ki, ölməyə bu müstəhəqdir?
Vəlakin hər kişi gər ola aqil,
Hər işdə var qıla səbrü təhəmmul.
Ölüyə bir daha vermək deyil can,
Vəlakin dirini öldürmək asan.
Bulunur bəhrə səbrilə hər işdən,
Ki, səbr ilə çıxar şəkkər qəmişdən.
Könül bağlagilən bu etiqadə,
Ki, səbriylə yetər hər kim muradə.
Olur qora vəli səbriylə halva.
Olur bir qətrə sudan hüsni-ziba.
Sədəf dəfninə çün yağmuri-baran[2],
Düşər səbriylə olur dürri-qəltan.
Eşitdi çünki təcil etdi sultan,
Özü öz felinə oldu peşiman.
Çəkibdir çünki oğlan mənə şəmşir,
Durun möhkəm vurun boynuna zəncir.
Tutuldu çün giriftar oldu oğlan,
Oradan köçdülər, buyurdu sultan.
Rəvan düşmən saruya qıldı ahəng,
Supahi düşmən ilə qıldılar cəng.
İki yandan bərabər durdu ləşgər,

[1] Üzü qara
[2] Yağış

Sanasən zahir oldu ruzi-məhşər,
Dilavərlər qılıb meydanda cövlan,
Supahilər qanından doldu meydan.
Pəs ol dəm qopdu bir aşubi-qovqa,
Fələk eylərdi ol cəngə təmaşa.
Töküldü gövdələr, başlar kəsildi,
Bular güclü olub, onlar basıldı.
Bulara verdi həqq, basıldı düşmən,
Bular şad olub, onlar etdi şivən.
Kisb[1] eylədilər, onlar firavan,
Oradan şadü xürrəm, döndü sultan.
Gəlib yetişdilər bir mürğzarə[2],
Neçə gün oldular məşğul şikarə.
Hamu onlar gəlib xoşnudü xoşhal.
Gəl oğlanın atasından xəbər al!
Ona qasid yetirdi çünki namə,
Bişarət verdi o, əsbabi-mayə.
Dedi səd mərhəba, fəxrəndə qasid!
Bizə mətlub idi və həm məqasid[3].
Yola düşdü belə[4] götürdü malin,
Hamu fərzənd[5], əsbabi, əyalin.
Yetişdi çünki ol şəhri diyarə,
Düşüb əyləndi bir xəlvət kənarə.
Xəlayiqdən xəbər eylədi məlum,
Dedilər ona: ey miskin, məzlum!
O igid kim deyirsən şahə pabus[6],
Giriftari-bəla zindanə məhbus.
Olubdur gecə-gündüz işi əfqan,
Deyirlər öldürər əlbəttə sultan.
Eşitdi bu sözü çün ol cigərxun,
Özündən getdi, oldu çün digərgun[7]

[1] Qənimət
[2] Quşların düşərgəsi
[3] Məqsədlər
[4] Özü ilə
[5] Övlad
[6] Ayağından öpmək – təzim etmək
[7] Halı dəyişdi

Özünə gəldi o biçarə məhrum,
Olurdu naləsindən daşlar mum.
Pərişan oldu düşdü canə lərzə[1],
Rəvan ol padişahə yazdı ərzə.
Ki, şaha dövlətin payəndə[2] olsun,
Sənə xəlqani aləm[3] bəndə[4] olsun,
Ziyadə olsun ol cahü-cəlalin.
Füzun[5] olsun kəmali-bizəvalin.
Başın götür, nəzər qıl bir xudayə!
Rəva görmə sitəm mən binəvayə.
Cəfalar çəkmişəm, artıq ölümdən,
Pərişan olmuşam, sən tut əlimdən.
Şəha, qılma mənə sən zülmü bidad!
Əlindən ruzi-məhşər eylərəm dad.
Bu gün mən belə eşitdim ki, sultan,
Qılıbdır bir igid məhbusi-zindan.
Giriftari bəlavü möhnəti-bənd,
Mən atayam ona, ol mənə fərzənd.
Onun var idi bir ayru qardaş,
İkisi belə, anaları yoldaş,
Məni istəməyə gəlmişdi onlar
Mən onlardan deyildim çün xəbərdar.
İkisin bir gecə dəryaya saldım,
Bunu tapdım, qəvvasdan satın aldım.
Birin heç tapmadım, gəzdim cahani,
Canımda həsrəti qalmış nihani.
Onun hicrində bağrım dağ olubdur,
Yenə burada ol dustaq olubdur.
Ümidim var ki, bu dövlətli sultan,
Mənə mən[6], etməyə əltafü[7], ehsan.
Mənə sata yenə işbu qulami,

[1] Titrətmə
[2] Möhkəm
[3] Dünya xalqları
[4] Qul
[5] Artıq
[6] Mane
[7] Lütflər

Verəlim malü əsbabi təmami.
Zərü simü, cəvahir, ləl, mərcan,
Şirin canim onun yolunda qurban!
Yetirdi ərzəni alicənabə,
Oxudular yetişdi ol xitabə.
Eşitdi onda çün dərya sözünü,
İtirdi sanasan sultan özünü.
Buyurdu: gətirin əndər zəmani,
Bu ərzə yiyəsi olan cavani.
Gətirdilər onu əndər hüzurə,
Dedi sultan, pəs ol mərdi-səburə[1],
Necədir söylə gəl əhvali-dərya!
Ki, əqlim oldu qayət, səbr yəğma[2].
Başından keçdiyin ol Xacə bir-bir,
Bəyan elədi şahə şərhü təqrir[3].
Baxıb ağzına onun oldu mail,
Özündən getdi, ağlı oldu zayil.
Zəman keçdi, çün gəldi özünə,
Atası ayağın sürtdü üzünə.
Dedi: baba, mənəm ol böyük oğlan,
Olan müstəqriqi dəryayi-hicran[4].
Ata və qardaşım təqdiri Allah,
Yetirdi mənə çün əlhəmdülillah,
Sicud[5] eylədi dərdəm şükri yəzdan[6],
Rəvanə oldu dərdəm suyi[7] zindan.
Qılıb qardaşını zindandan azad,
Ana oğlanlar ilə oldular şad.
Hamısı səbrlə yetdi muradə,
Deməsən dərdü-sər bundan ziyadə.
Fədai, səbr qıl, olduqca imkan!
Ki, kimsə səbrdən olmaz pəşiman.

---

[1] Səbirli
[2] Səbrim qarət oldu (əldən getdi)
[3] Təfsilatilə
[4] Ayrılıq dənizində qərq olmuş
[5] Səcdə, təzim
[6] Allah
[7] Tərəf

Yetər məqsudinə səbrilə hamu,
Ki, səbriylə açılar bağlı qapu.
Bu nəğli Bəxtiyar edincə itmam,
Yenə gün batdı, oldu vəxt axşam.
Onu apardılar zindanə ol dəm,
Yenə bağladılar məzbut və möhkəm.
Səhərgəh çün boşüd[1] xurşid taban,
Vəziri-seyyum aməd pişe sultan[2].

## ÜÇÜNCÜ VƏZİRİN PADŞAHA ƏRZ ETMƏSİ

Sabah oldu yenə xurşidi-ənvər,
Çıxıb dünya üzü oldu münəvvər.
Var idi padşahın bir vəziri,
Əcayib, xurdəbin[3] və dadgiri.
Ona qoymuşlar idi Afərin nam,
Müdəbbir[4], kardan[5], niku-sərəncam[6].
Dedi sultana ol bir neçə sözlər:
Ki, sultan bağrına yapışdı közlər,
Dedi: ey padşahi-nik-fərcam![7]
Sənin tək yoxumuş rüsvay, bədnam.
Əgər yoxdur sənin canında qeyrət,
Təqafül eyləmə ey bihəmiyyət!
Bunu öldürginən sən, nam badə
Gedibdir, saxlama bundan ziyadə.
Nə söylər kim sənə əhli-zəmanə,
Qulaq asırsan, ol söylər fəsanə.
Gətirdilər pəs oldəm Bəxtiyari.
Kəsilmiş çarəsi, yox ixtiyari.

---

[8] Oldu
[9] Üçüncü vəzir sultanın yanına gəldi
[1] Xırdaçı
[2] Tədbirli adam
[3] İş bilən
[4] Tədbirli
[5] Aqibəti xeyirli olan

Ki, ey biabru, şərməndeyi-dun
Bizi aləmdə sən rüsvay qıldın!
Sənin aləmdə adın eyləyim güm[1],
Dəxi qılmam sənə lütfü tərəhhüm.

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-vala![2]
Sənin olsun pənahın həqq-təala.
Yamanın olmasın ey şahi-kamil!
Yaman olmaz şaha səbrü təhəmmül.
Təhəmmül eyləmək rəhman işidir,
Ki, təcil eyləmək şeytan işidir.
Necə kim səbr qıldı mərdi-Sabir,
Hami mətlubi[3] hasil oldu axir.
Ki, səbr etdiyi üçün onu Allah,
Çıxarıb çah[4] içindən, eylədi şah.
Dedi: sultan kimi idi ol diləfkar?
Ki, səbr etdi necə kim gördü azar.
Onun məskəni neyşə[5] çah oldu,
Neyşə çahdan çıxıb ol şah oldu?

## BƏXTİYARIN SABİR SƏRGÜZƏŞTİNİ NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar: ey, bəxt yarın,
Münəzzeh[6] eybidən namusü arın.
Eşitmişdim məgər bir dastani,
Oxurdu cəm içində qıssəxani[7].

---
[1] İtmiş
[2] Böyük
[3] Arzuları
[4] Quyu
[5] Nə üçün
[6] Təmiz
[7] Nağıl danışan

Müəzzəm, mötəbər, məmurə[1], bir kənd,
Var idi onda bir mərdi-xirədmənd.
Çox idi fikri, həm çox şükri, səbri,
Yox idi qeyri-taət[2], heç fikri.
Var idi bir bölük mali, davari.
Kim onunla keçərdi rüzgari.
Qulami-padşahi-əsri dövran,
Tələb eylər olardan, mali-divan,
Əlinə almış ol hökmi-bərati,
Bəqayət döydü onda türkü, tati.
Hücum eylədi pəs onda rəiyyət,
Yetişdi ol igidə zəxmi[3] zərbət.
Kişi ol yarələrdən öldü nagah,
Bu mənidən xəbərdar oldu çün şah.
Buyurdu etdilər ol kəndi qarət,
Yetişdi kəndə onda çox xəsarət[4],
Əlindən Sabirin həm getdi mali,
Dedi bir gün ona əhli-əyali:
– Driqa nedəlim, mal oldu tarac,
Ki, qaldıq binəva, miskinü möhtac.
Sənin bu davada yoxdur günahın,
Ki, qorxma, həqq-təaladır pənahın.
Yazıb bir ərzə get sən padşahə,
Həqiqət ərz qıl sən barigahə.
Sənin çün ona məlum ola halın,
Ki, şayəd geri verə yenə malın.
Dedi Sabir ki, ey pakizə övrət!
Eşitmişəm, atam qılmış vəsiyyət.
Ki, ta kim, hər kəs uğrasa bəlayə,
Riza verməк gərək labüd qəzayə.
Ki, səbr ilə olur hər müşkül asan
Ki, təcil eyləməkdir feli-şeytan[5].

---

[1] Abad
[2] İbadətdən başqa
[3] Yara
[4] Zərər
[5] Şeytan işi

Edəlim biz dəxi səbrü təhəmmül,
Xuda raziqdir[1], ona qıl sən təvəkkül.
Tutalım yüzümüz qadir ilahə,
Kim ol versin xəbər ol padşahə.
Bizim dadımızı həqq ondan alsın,
Bizim tək dəxi o, biçarə qalsın.
Əlindən gedə yarəb, mülkü mali,
Gəda olsun, pərişan ola hali.
Olaydıq ol qədər dünyadə zində[2],
Onu görəydik biz belə gündə.
Gedəydi günümüzdən işbü qeyqu,
Eşitdi günümüzdən işbü qeyqu,
Eşitdi bu sözü bəlxah, bədgu[3].
Yetirdi bu sözü ol şəhriyarə,
Çü pünhan sözü qıldı aşikarə.
Ki, vardır bir kişi adı Sabir nam
Şaha çox söylədi nifrinü düşnam[4].
Buyurdu dərdəm, ol birəhmü qəddar,
Ki, varsın bir neçə zalim, sitəmkar.
Qılıb cövrü sitəm, yoxsul və möhtac,
Onu bu ölkədən qılsınlar ixrac[5].
Döyüb də sındırın əlin-ayağın,
Gətirsin belə həm oğul-uşağın.
Necə əmr eylədi ol bisəadət,
Fəqirə qıldılar zülmü siyasət
Onun çün tirə oldu rüzgari,
O yerdə qalmadı səbrü qərari.
Gecə oldu onun çün ruzi rövşən,
Qovub çıxardılar ol məmləkətdən.
Ürəyi dopdolu qan, bağrı parə,
Çıxıban getdilər özgə diyarə.
Biləsincə[6] iki oğlu, bir övrət,

[1] Ruzi verən
[2] Diri
[3] Şər danışan
[4] Söyüş
[5] Xaric etmək
[6] Yanınca

Gedərlərdi çəkib rəncü məşəqqət.
Ayaq yalın, başı açıq, piyadə,
Dəxi möhnət nədir bundan ziyadə?
Bu hal ilə gedərkən ol diləfkar,
Kim uğradı ona bir neçə xunxar[1].
Olar ilə bilər yox mali dünya,
Kim oğrular edə talanü yəğma[2].
Təməh elədilər oğlanlarına,
Yetişdilər oların yanlarına.
İki tifli[3] onlardan aldı onlar,
Yanıb həsrət oduna qaldı onlar,
Gedər onlar, bular qıldı nəzarə,
Ciyər firqətdən oldu parə-parə.
Ana başın açıb eylərdi şivən,
– Nedim[4], qanda[5] varım, nə eyləyim mən?
Saçın yoldu, üzünə saldı dırnaq,
Başına sovururdu daş və torpaq.
Dedi Sabir: – Qəbul eylə nəsihət!
Həqqin təqdirinə səbr eylə övrət!
Eşitdim ta necə səbr etdi Eyyub,
Ki, tapdı Yusifi səbriylə Yəqub.
Həqqə şükr eylə, dəxi olma qəmgin,
Ol övrət səbr tapdı oldu təmkin.
Yeridilər olar biab[6], binan[7],
Diləfkarü həzin, iftanü xizan[8].
Dəxi heç görmədilər el və oymaq,
Yetişdilər qəzara gün batan çaq,
Müəzzəm şəhr, yaxşı bir məkanə,
Dedi Sabir ki, ey banuyi-xanə[9],

[1] Qan içən (quldur)
[2] Talamaq, çapmaq
[3] Uşağı
[4] Nə edim
[5] Harada
[6] Susuz
[7] Çörəksiz
[8] Yıxılaraq, qalxaraq
[9] Ev xanımı

Bu dəm gün batdı, bivaxt oldu zinhar,
Bu şəhr içində əlbəttə əsəs[1] var,
Sən əylən münda mən şəhrə gedəyim,
Gətirib yeyəcək fikrin edəyim.
Sabah olcaq olayım şəhrə daxil,
Ki, səbr ilə olur mətlub hasil.
Oradan getdi Sabir, qaldı övrət,
Yetişdi bir cavani-pak tələt,
Müsəlləh, ol cavan olmuş süvarə,
Yetişdi çün ona qıldı nəzarə
Dedi: – Ey nazəninü sərvü bala!
Güləndamü səmən-sima, dilara!
Neşə yalquz burada əylənibsən?
Gəl indi şəhrə aparım səni mən!
Mən eyləyim sənə ikramü ezaz,
Sən eylə mənə qəmzə, işveyü naz.
Dedi övrət ona: pəs ey bəradər!
Rəva deyil, bir övrətə iki ər
Yəqin bil ey cavani xub-kirdar![2]
Deyiləm mən dəxi yalqız, ərim var.
Cavanü nazənin, xubi-çöhrə,
Dəmadəm gələr indi, getdi şəhrə.
Yeri qardaş yoluna, sən işin tut!
Məni necə ki, gördün elə unut!
Bu yerdə yox məgər divani sorğu?
Qəzəbləndi, dedi ol tünd bədxu[3].
Mənimlə gəlməsən ey paki-daman!
Sənin canındadır bu tiği-bürran[4].
Davasız qaldı ol biçarə övrət,
Əliylə torpaq üstdə yazdı bir xətt,
"Məni apardılar bu şəhrə, Sabir!
Əyan olsun sənə əhvali-zahir!"
Ol övrət natəvan, döz bu fəraqə,

---

[1] Gecə qaravulu
[2] Tərbiyəli
[3] Pis xasiyyətli
[4] İti bıçaq

Kişi götürdü onu getdi şəhrə.
Ol igidin anası yaxşı övrət,
Var idi bir zəifə, pak seyrət[1].
Sözü şəkkər, özü gülbərk[2] xəndan,
Mürüvvətli, həyali, əhli-iman.
Fəqirü, binəvalər qəmküsari,
Mütii-əmr həqq taətgüzari[3].
Bu övrət gördü çün ol pakizadi,
Ətəyindən tutuban qıldı dadi:
– Gəl ey övrət, xudanın hörmətiçün
Məhəmməd Mustəfanin izzətiçün.
Gəl ey ana, mənə qıl gəl, şəfaət,
Bu oğlandan mənə ol gəl himayət,
Mənə sən olmasan gər yarü yavər,
Tutaram ətəyindən ruzi-məhşər.
Bu oğlandan mənim ol sən pənahim.
Ki, səndən qeyri yox bir ümidgahim.
Xəbərdar ola Xatuni qiyamət,
Əlindən eylərəm ol gün şikayət.
Dedi Xatun: əgər vardır səlahin,
Edim onunla mən əğdü nigahın,
– Yəqin bil ey ana, sən xub-kirdar,
Ərim vardır, ərim vardır, ərim var.
Dedi övrət: sənə ərz eylədim mən,
İki dünyada sən mənim qızımsan.
Əlin verdi ona həm qıldı iqrar,
Çağırdı oğlunu xatuni-dindar.
Dedi: oğul, eşit, ol gəl xəbərdar!
Bu övrət verdi mənə çünki iqrar,
Mənim oldu qızım, ol sənə xahər[4],
Təməh ondan götür, ey cani-madər.
Əmanət, əl-əmanət, əl-əmanət![5]

---

[1] Əxlaqlı
[2] Gül yarpağı
[3] Əmrə tabe olan
[4] Bacı
[5] Bu başqasının arvadıdır, bizim üçün əmanətdir.

Utan həqdən buna qılma xəyanət.
Onun halindən ol məsturə övrət[1],
Olurdu gecə-gündüz vaxt, bivaxt.
Xəbər al indi qanda getdi Sabir?
Gör onun başına nə gəldi axır?
Gəlib əkmək[2] alıb Sabir əlində,
Qayıtdı gördü övrət yox yerində.
Qayıtdı gördü övrət yox yerində.
Tökər hər dəm gözündən əşki-gülgün[3],
Sanasan Leylidən ayrıldı Məcnun.
Çəkər nalə deyərdi: ey fələk, dad!
Məni sən etmədin bir ləhzə[4] dilşad.
Yıxıldı xanimanım, oldu tarac,
Gədalıq, ac-susuz, xəlqə möhtac.
Məni avarə eylədin vətəndən,
Həm üzüldü əlim, göru kəfəndən.
Mənimlə eylədin sən məkrü hiylə,
Cida düşdük, qamu qovmü qəbilə.
Xaçan[5] rəhm eylədin, məndən qayırdın[6],
Ciyər guşələrim məndən ayırdın.
Mənimlə belə qalmışdı bir həmdəm
Nə gəldi başına, netdin[7] onu həm?
Driqa xanda[8] getdi, yari qəmxar
Onunçün gecə-gündüz ağlaram zar.
Sızıllaram, pərişan oldu halim,
Mənim yarəb əlimdən getdi malım.
Driqa neyləyim, biçarə qaldım,
Qəribü bikəsü avarə qaldım.
Gecə-gündüz gəzəydim mən cahani,
Nola ondan tapaydım mən nişani!

---

[1] Üzü örtülü (həyalı) arvad
[2] Çörək
[3] Qanlı yaş
[4] Bir anlıq
[5] Haçan, nə vaxt
[6] Mənim işimi rast gətirdin
[7] Nə etdin
[8] Haraya

Qılırdı hər zaman ol zarü şivən,
Qaranqu getdi çün sübh oldu rövşən.
Baxıb gördü ki, övrət torpaq üstə
Yazıbdır key[1] fəqiri dilşikəstə!
Məni apardılar bu şəhrə, ey yar!
Qırağa getməmişəm ol xəbərdar!
Çü gördü belə yazmış ol nigari,
Gəlib bir guşədə tutdu qərari.
Qəzara padşahi-ol vilayət,
Bina qılmışdı bir ali imarət.
Buyurmuşdu ki, ol mərdi-sitəmkar,
Ki, hər gün gəlsin onda xəlq büsyar[2].
Hamu bimüzd[3], bikar işləsinlər,
Gecə-gündüz giriftar eyləsinlər.
Neçə kimsə müqərrər[4] eylədi şah,
Kimi görsələr onlar xah-naxah
Aparalar kim onda qıla bikar,
Kimin əlində ola zərrə dinar,
Verərdi rüşvət özün qurtarırdı,
Kimin yox axçası, onda qalırdı.
Bu halə çün deyil, Sabir xəbərdar,
Gəlib bir guşədə oturmuş ağlar.
Gəh övrət, gəh oğul, gəh dir[5]: malım,
Yetişdilər ona bir neçə zalım.
Neçə ağac ilə onun başına,
Vurub apardılar palçıq işinə.
Sabah axşam olunca işlədərlər,
Gecə – pəs onları məhbus edərlər.
Yox idi onlara bir ləhzə rahət,
Hədisi Mustəfadır bir rəvayət.
Cahan küfr[6] əhlinə olmuş gülüstan,
Vəli mömünlər üçün oldu zindan.

---

[1] Ki, ey
[2] Çoxlu
[3] Müftə, maaşsız
[4] Qərara almaq; təyin etmək
[5] Deyər
[6] Kafərlər

Cahan dopdolu xarü niştərdir[1],
Batır bağrına kim ki, rəhmgərdir.
Bəlavü möhnətü ənduhü[2] qürbət,
İzafə oldu bu rəncü məşəqqət.
Onilə həm belə bir mərd miskin,
Var idi dilşikəstə, zarü qəmgin.
Gecə ağlar idi, zarü giryan[3],
Dedi Sabir: ona ki qılma əfqan.
Həqqə şükr eyləyib səbr eylə pişə,
Ki, bidadü sitəm qalmaz həmişə.
Görərsən bir gün ey yari-yeganə,
Əsər yox zülmü zalimdən nişanə.
Bəsa[4] hökmü, bəsa zalim, sitəmkar,
Ki, zülmündən olur mənzilləri nar[5].
Bəsa kimsə ola çah ona zindan,
Çıxıb çahdan ola mənzili sultan.
Qəzara şah çün ol yerdə hazir,
Eşitdi hər nə söz söylədi Sabir.
Eşitsən bir xəbər xoş mötəbərdir.
Ki, həqq söz batilə oxdan bətərdir.
Ki, həqq söz ola həqqə şəhdü-şəkkər[6],
Gəlir nahəqə çün şəmşirü xəncər.
Qəzəbləndi, yaman tünd oldu, coşdu,
Sana kim o yanar odlara düşdü.
Buyurdu ol zaman ol bimürüvvət,
Ona eylədilər çox-çox siyasət.
Gətirdilər salıb bir çahə möhkəm,
Özü çağırdı dedi ona ol dəm:
– Burada səbr qıl ta çərxi dövran,
Səni mundan çıxarıb edə sultan.
Quyuya saldı onu ol sitəmkar,
Bu halə olmadı heç kim xəbərdar.

[1] İti tikan
[2] Kədər
[3] Ağlar halda
[4] Çoxlu
[5] Od, atəş
[6] Şirni, qənd

Qaranqu yerdə çahə düşdü Çabir,
Qılırdı səbr pünhan, şükr zahir.
Yüzün həqqə tutub qıldı ibadət,
Həmişə səbr, şükrü, zikr, taət,
Vəlakin bir igid halindən agah,
Olub onu anardı gahü bigah.
Ona gahi salardı əndək əkmək[1],
Müyəssər olunca bir loğma əkmək.
Səbəb oldu ona, Allah kərimdir.
Vəli bilməzdi ol biçarə kimdir.
Quyu içrə həkimanə, qənaət,
Qılardı səbr, şükr, zikr, taət.
Var idi ol şaha bir yaxşı qardaş,
Hamü mömünlərə, miskinə yoldaş.
Qəzara, çünki yox təqdirə təbdil,
Məgər bundan irəli bir neçə il.
Niku ruyü[2], niku xuyü[3], kəm azar[4],
Hökumətdən, şəriətdən xəbərdar.
Rəiyyətpərvərü, miskin nəvazi
Rəiyyət, ləşgər ondan cümlə razi.
Xuda tərs[5], əhli-insaf, nikukar,
Ki, kimsə görməmiş ondan azar.
Müdam[6] ondan çəkərdi şah qorxu,
Canında var idi, yüz fikr, qeyqu.
Məbada ləşkər ona ola tabe,
Qılalar arada sultanı zaye.
Bu fikri eylədi çün ol hünərsiz,
Onu öldürdü xəlvətdə, xəbərsiz.
Nihan eylədi ol torpağa pünhan,
Xəbərdar olmadı əşrafü, əyan.
Görünməz oldu çün bir neçə müddət,

[1] Bir az çörək
[2] Xoş sifət
[3] Gözəl xasiyyətli
[4] Azar verməyən
[5] Allahdan qorxan
[6] Həmişə

Təfəhhüs[1] etdilər ərkani-dövlət.
Sözü sultan olardan çün eşitdi;
– Rəvanə eylədim, təhsilə getdi!
Xəlayiq eylədi bu gümani,
Tutubdur şah onu saxlar nihani.
Bu əsnadə ki, zülm eylədi bidad,
Əlindən külli aləm eylədi dad.
Səbəbsiz eylədi çoxları tarac,
Rəiyyət oldu bir əkməyə möhtac.
Dedi bir-birinə ərkani-dövlət,
Qəsəm yad eyləyübən əhd beyət.
Gəlib cəm oldu, çün əşrəfü əyan,
Onu öldürmək üçün əhdü peyman.
Olub bizar ondan döndü ləşgər
Rəiyyət, məmləkət ona sərasər.
Xəbərdar oldu çün əşrafi əyan.
Gecə qaçıb tutub rahi biyaban.
Nə sultan, kim ədalətdən bəridir[2],
Onun bədxahi həm öz ləşgəridir.
Gecə çün qaçdı ol, qurtardı cani,
Buraxdı taci-təxti, xanimani.
Yığıldı, dedi çün əlavü ədna,
– Gərəkdir bizə bir sultani dəna[3].
Şücaü[4] pəhlivan, həm özü adil,
Süxən təb[5], ola niku xəsail[6].
Var idi dedilər sultana qardaş.
Neçə müddətdir onu görməzəm faş.
Biri gəldi dedi: əndər zamani
Bilirəm, qandadır, ol növcəvani.
Kim onu eyləmişdi şah giriftar,
Siyəh çah[7] içrə mən oldum xəbərdar.

---

[1] Aramaq, axtarmaq
[2] Uzaqlaşmış
[3] Ağıllı
[4] Cəsarətli
[5] Söz bilən
[6] Xoş xasiyyət
[7] Qaranlıq quyuda

Bu sözdən çünki onlar oldu agah,
Dedilər: qandadır[1], göstər gəl ol çah?
Çü Sabir qalmış idi çah içində,
Həm ol gecə görər öz yuxusunda.
Kim onun üstünə gəldi peyəmbər,
Çirağі din, şəfii ruzi məhşər.
Dedi: şah ol, daxi qəm çəkmə Sabir,
Səninçün ruzi-hicran[2] oldu axir.
Sabah olcaq səni təqdiri Allah,
Bu iqlimə qılar bişəkk şəhənşah!
Onun əyninə geydirdi çü xələt.
Başına qoydu bir taci-dövlət.
Çü Sabir yuxusundan oldu bidar[3],
Sevindi həqqə qıldı şükri büsyar.
Əkabirlər gəlib çahə rəvani
Müşəxxəs eylədilər, ol rəvani
Müşəxxəs eylədilər, ol cavani.
Çağırdılar kim: ey məhbusi-bəndi,
Ayağa dur, yapış, saldıq kəməndi!
Dedilər: şah sən ol iqbalü bəxtə,
Gəl indi Sabir əylən sən bu təxtə.
Yapışdı, çəkdilər ol nikbəxti,
Ona tapşırdılar ol tacü-təxti.
Özün gül tək görüb, açıb qabağın,
Əkabirlər hamu öpdü ayağın.
Üzün tutdu hamı ol dəm xudayə,
Olub məşğul şah üçün duayə,
Ki: yarəb bu cavandır, bu cavanbəxt,
Ola fərxəndə buna tacü həm təxt.
İlahi, günbəgün artsın kəmali,
Fələk yar olsun, olmasın zavali.
Bihəmdüllah kim ol zalim, sitəmgər,
Nikunbəxtü[4], cəfakarü bədəxtər[5].

[1] Haradadır
[2] Ayrılıq günü
[3] Ayıldı
[4] Baxtı dönmüş
[5] Pis ulduzlu (bədbəxt)

Yox idi ədli çün biçarə oldu,
Əcəb bu ölkədən avarə oldu.
Əgər olmazdı ol bu yerdən ixrac,
Olurduq hamımız əkməyə möhtac.
Bihəmdüllah bizə oldu müyəssər,
Şahi-adil, təbiət dadgüstər[1].
Çü Sabir təxtə çıxdı, oldu sultan,
Gədayə, binəvayə qıldı ehsan.
Rəiyyətpərvər oldu şahi-adil,
Duayi-xeyr özüçün qıldı hasil.
Xozinə tökdü, ləşgərin qayırdı[2],
Ədalətdən, qılı qıldan ayırdı.
Həm etdi bir tərəfdən rəsmi-rəfət
Duaçı oldu ləşgər, həm rəiyyət.
Vəzifə[3]eylədi onlara təyin.
Nə yerdə var idi dərviş, miskin,
Rübatü[4] mədrəsə, həm körpü bünyad,
Qılıb məscidləri məmurü abad.
Nikuxislət[5], təməhsiz əhli-insaf,
Başına and içər əyani-əşraf.
Nə yerdə var idi, bədfelü kirdar,
Hamısın bir tərəf qıldı nikunsar.
Qayırdı ruzi divan, hökmü mütləq,
Yeməzdi kimsənin malin bənahəq[6].
Cahanə düşdü onun yaxşı adı.
Qılır səbr eyləyən hasil muradi.
Burada qalsın işbü nəğli-göftar,
Qulaq as pəs eşit, bir qeyri əxbar
Məgər ki, padşah ol cəhli nadan,
Ki, Sabir malini etmişdi talan.
Çıxarmışdı onu ol məmləkətdən,

---

[1] Ədalətli
[2] Ordu təşkil etdi
[3] Maaş, təqaüd
[4] Karvansara, düşərgə
[5] Yaxşı xasiyyətli
[6] Haqsız

Nə gəldi başına gör ol cəhətdən.
Oturmuşdu məgər mülkündə eymən[1],
Onun üstünə gəldi taki düşmən.
Bərabər durdu ol bihəmiyyət,
Basıldı, çünki ondan döndü dövlət.
Hamı cəmiyyəti talanə getdi,
Götürüb hərəmin bir yana getdi.
Ərü-övrət hər ikisi dil pərişan,
Biyabanda gəzər, biabü binan.
Gəzib hər yerdə sərgərdanü gümrah,
Yetişdi Sabirin şəhrinə ol şah,
Dedilər Sabirə ey ədligöstər!
Gəlibdir şəhrə bir örət və bir ər.
Pəs ondan edəlim əhvali-məlum,
Müqərrər edəlim biz ona mərsum[2].
Gətirdilər pəs ol dəm əhli-xidmət,
Olara qıldılar ezazü hörmət.
Tamam oldu, yetişdi, çünki vədə,
Gəlibən padşaha qıldı səcdə.
Özüyçün zahir oldu, hali-pünhan.
Buyurdu qullara ol dəmdə sultan.
Özündə, övrətində hər nə kim var,
Dürü, ləlü, cəvahir, zərri-büsyar.
Alubən əllərindən, acü möhtac,
Vilayətdən onları qıldı ixrac.
Bunu görüb vəzirü əhli-divan
Bəqayət[3] oldular xatir pərişan.
Dedilər padşah oldu sitəmgər,
Bəeyni bu dəxi oldu bərabər.
Çəkərsən hər nə fel[4] etsən cəzasın,
Ki, qoymaz, həqq sənə onun qisasın.
Buyurdu ol zaman çağırdılar car
Nə ölkədə kimin satlıq qulu var,

[1] Xatircəm
[2] Qəbul təşrifi
[3] Son dərəcə
[4] İş

Gətirsinlər ki, sultan müştəridir.
Təqafül eyləyən tənbeh yeridir.
Olar ki, Sabirin oğlanlarını,
Aparmışdı onların canlarını.
Olar həm oldular çün kim xəbərdar,
Gətirdilər oları həm bəbazar.
İki oğul tanıdı ol cigərxun,
Sanasan aqil ikən oldu məcnun.
Buyurdu oğruları sərt, möhkəm
Tutub bağladılar, həm əndər, on dəm[1].
Ağac altına saldılar oları.
Əlin-ayağın sındırdı vari.
Tökülmüş başdan-ayağa qızıl qan
Duruban qaçdılar, iftanü xizan.
Yenə dedi vəzirü mirləşgər[2],
Nə heyf oldu ki, şah oldu sitəmgər,
Vəlakin qorxudan ərkani-dövlət,
Edə bilməz dəxi kimsə nəsihət
Eşit indi nə etdi gör ol övrət.
Ona eylər idi xatun himayət.
Ona olmuşdu daim nigəhban[3],
Xəyanət etməyə ona ol oğlan.
Eşitmişdi ki, ol pakizə övrət,
Ki, gəlmiş padişahi baədalət[4].
Məgər bir gün bilib fürsət həm ol zən[5]
Çıxəb evindən eylər ahü şivən.
– Müsəlmanlar, mənə çox zülmü bidad,
Olubdur, hanı sultan, eylərəm dad!
Bu halə ol igid oldu xəbərdar,
Tutubdur yaxasından ol sitəmkar.
Deyər övrət: neçə il oldu yaran,
Məni qılmışdı evində pünhan.

---

[1] O vaxt
[2] Qoşun başçısı
[3] Gözətçi
[4] Ədalətli
[5] Qadın

Deyər kişi, ki, sən məkr etmə övrət!
Mənə sən eyləmə böhtanü töhmət.
Görün yaran ki, bu münkər olubdur,
Həvayi-eşqilə könlü dolubdur.
Onu mən döymüşəm, istər bu kinə,
Məni salıb gedə bir özgəsinə.
Bu halə çünki, agah oldu sultan,
Tələb qıldı oları etdi divan.
İrəli gəldi kişi, dedi: ey şah!
Bu xatun övrətimdir, ol gəl agah!
Məaş etməz[1] mənimlə, bihəyadır
Bu gerçəkdir ki, övrət bivəfadır.
Çağırdı onu sultan dedi: ey zən,
Onunla sən nöşün nasaz olubsan?[2]
Dedi övrət ki: ey sultani-dərgah!
Deyil ərim mənim bu haşalillah!
Ərim olsaydı bu qurban olardım
Ərim görsəydim mən heyran olardım.
Tamam hal-əhval olduğun zən,
Sərasər ərzi-halin qıldı rövşən.
Bürünmüş bərk ol məsturə[3] məhbub,
Görünməz surəti kim tanıya xub.
Tanıdı övrəti, sultan boyundan,
Sanasan tükləri çıxdı donundan[4]
Hərəm sarı buyurdu getdi övrət.
Kişiyə qıldılar zülmü siyasət,
Kişi məcruh[5] olub qanına qəltan,
Buyurdu etdilər məhbusi-zindan
Bu halı gördü çün əşrafü əyan,
Dedilər şahə: – Yoxdur səndə bir qan?
Veribdir zülmilə qardaşı badə,
Dəxi möhnət nədir bundan ziyadə?

---

[1] Yola getməz
[2] Yola getməmək
[3] Üz örtüyü
[4] Tükləri biz-biz oldu
[5] Yaralı

Bu nə cövrü sitəm, bu nə fəqandır?
Məgər dövlət səninlə sərgirandır?
Bu nə bidaddır, bu nə siyasət?
Məgər döndü səninçün bəxtü-dövlət.
Dedi: – Mən neyləmişəm ey büzürgan![1]
Yetirdim kimsəyə azarü nöqsan?
Dedilər: – Hani miskinü məzlum,
Bu şəhrə gəldi ol biçarə məhrum.
Malın sən taladın, biçarə qıldın,
Qovub bu şəhridən avarə qıldın.
Sənin şəhrinə gəlmişdi mehman,
Gərək sən eyləyəydin lütfü ehsan.
İki qul həm gətirdilər bu şəhrə,
Yetirmədin olara xeyrü bəhrə.
Çəkib qulları sən aldın olardan,
Ayaq kəsdi xəlayiq bu diyardan.
Olara vermədin qiymət bir altın,
Oları eylədin aludeyi-xun[2]
Çəkərsən zülmülə biganə övrət,
Ərinə eylədin zülmü siyasət.
Nə zülm olur dəxi bundan ziyadə?
Heyif ki, yaxşı adın getdi badə.
Dedi sultan olara ki: cəmaat!
Qulaq asın, edim mən bir hekayət.
Deyirsiz kim, məgər biçarə övrət.
Ərinə eylədim zülmü siyasət.
Mənə həqq verdi fürsət xilafi,
Alıb malın ona qıldım təlafi[3],
Həm ol qullar dəxi, oğlanlarımdır,
Bədəndən ruhi şirin canlarımdır.
Nə qılsan çəkdirər Allah cəzasın,
Qiyamət gününə qoymaz qisasın.
Yenə övrət dəxi öz övrətimdir.
Yəqin hasil edin, Allah kərimdir,

---

[1] Böyüklər
[2] Qana bulanmış
[3] Qisas

Nə kim çəkmiş zi əvvəl[1] ta bəaxır,
Hekayət eylədi ol dəmdə Sabir.
Sizə mən sirrimi çün eylədim faş,
Deyildim mən sizin sultanə qardaş.
Dözüb səbr eylədim, qaldım aradə,
Yetişdim səbrü ucundan mən muradə.
Əgər görsə kəsi azarü nöqsan,
Əgər səbr eyləsə olmaz pəşiman.
Bəlayə səbr qıl, şükr et xudayə,
Səni bişək yetirər müddəayə[2].
Olur təcil edən şeytanə tabe
Hamı işi olur əlbəttə zaye,
Sizindir məsləhət, yox ixtiyarım,
Keçər necə olarsa, ruzigarım,
Olar da bu sözü çün qıldı yəqin,
Dedilər: afərin, səbrü və təhsin!
Sənə çün yar olubdur taleü bəxt,
Sənə şayistədür[3], həm tac, həm təxt.
Çü dövlət verdi sənin tək əzizə,
İnayət eyləmiş Allah da bizə.
Bu dövlət getməsin sən tək əzizdən,
Ki, sayən olmasın kəm üstümüzdən.
Bu dövlət kim sənə görməz rəvadır,
Onun gözünə batsın mixi-məstur.
Qulamik biz hamu, sənsən xudavənd,
Fəda olsun yolunda malü fərzənd.
Bəli, hər padşah kim ola adil,
Duayi xəlq olur ona həmayil.
Nə sultan kim, olursa, ədlü dadi,
Özündən sonra qalır yaxşı adi.
Vəli, hər padşah ola sitəmgər,
Rəiyyət edə nifrin ona ləşgər.
Çü Sabir oldu sultani-cahanbəxt,
Müsəlləm oldu ona tac, həm təxt,

[1] Əvvəldən
[2] Arzuya
[3] Layiqdir, yaraşır

Eşit gör netdi[1], ol mərdüdü gümrah,
Ki, tutub Sabiri salmışdı dər çah.
Yığıb üstünə bir anidə ləşgər,
Gəlib Sabir ilən cəng etmək istər.
Bu həm qıldı qamu fikrin mühəyya,
Müqabil durdular, çün qopdu qovğa.
Çü ol bədbəxtdən dönmüşdü dövlət,
Həqq ol Sabirə yəqin verdi fürsət.
Tutub gətirdilər ol nabikari[2],
Basıldı ləşgəri ol dəmdə vari[3].
Qaçıb ləşgər, ələm oldu nikünsar[4],
Həzimət[5] oldular, basıldı sərdar.
Gətirdilər onu əndər müqabil,
Dedi Sabir ona: ey mərdü qafil!
Mənə sən bil müqərrər eylədin çah,
Neşə, mən səbrilə oldum bu gün şah.
Yəqin bil ki, sənə yoxdur xilasi,
Qiyamətə kimin qalmış qisasi?
Pəs ol dəm Sabir onu saldı çahə,
Tərəhhüm etmədi ol rusiyahə.
Çəkib cövri-cəfa həddən ziyadə,
Olurdu orada ta can verdi badə.
Çü səbr eyləi Sabir çıxdı əzçah[6]
Qılubən səbr, şükr oldu şəhənşah,
Çü ol zülmə yetişdi, çahə düşdü,
Sözü ibrət olub, əfvahə düşdü.
Eşidən, dinləyən olmaz pərişan!
Ki, səbr ilə olur hər müşkül asan.
Bu nəğli Bəxtiyar edincə itmam,
Yenə gün batdı, oldu vəxti-axşam.
Yenə bənd eylədilər Bəxtiyari,
Ki, dinlə necə ola rüzgari.

---

[1] Nə eylədi
[2] Yaramaz
[3] Bütün qoşun
[4] Bayraq yatırıldı
[5] Məğlub
[6] Quyudan

## DÖRDÜNCÜ VƏZİRİN PADŞAHIN YANINA GƏLMƏSİ

Vəzirin biri gəldi çarimin ruz[1],
İşi bədguluq idi, adı Şəhruz.
Şəhə səcdə qılıb Şəhruz bədbəxt,
Dedi: – Yox, padşahım səndə qeyrət,
Nə sözlər gör keçər xəlq arasında,
Neşə sən saxlıyasan bunu zində[2].
Məgər yoxdur səninçin, dust-düşmən?
Utanıb bir həya etməzmisən sən?
Dedi, neçə təərüzgünə[3] sözlər,
Ki, sultan bağrına yapışdı közlər.
Acıqlandı, rəvan hökm etdi sultan,
Gətirdilər onu iftanü xizan.
Dedi: ey Bəxtiyari-bəxti-qarə!
Bu gün olan[4] gərək sən parə-parə!
Necə edim səni zindanda məhbus,
Mənimçün qalmayıbdır nəngü namus.
Sənin səbrilə işin olmaz asan,
Ölümdən qeyri yox dərdinə dərman.

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey bəxti azad!
Həmişə sən olasan xürrəmü şad!
Qəzaya olmuya təqdirü təbdil,
Məni öldürməyə sən qılma təcil.
Gər öldürsən məni ey şahi-dövran,
Olasan qorxuram axir pəşiman.
Necə kim, ahu həsrət çəkdi Behzad,

[1] Dördüncü gün
[2] Diri
[3] Etirazedici söz
[4] Olasan

Pəşiman oluban eylərdi fəryad.
Deyərdi ki, pəşimanam, pəşiman!
Vəlakin yox imiş bu dərdə dərman.
Dedi sultan ona: kim idi Behzad?
Nöşün oldu pəşiman, qıldı fəryad?

## BƏXTİYARIN BEHZAD SƏRGÜZƏŞTİNİ NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-bəxtlu!
Nə kim vardır sənə bədxahü bədgu,
İlahi, ola bəlgular dili lal,
Pərişan, müztərib, şuridə əhval.
İki gözdən ola[1], sənə bədxah,
Həmişə qala sərgərdan və gümrah.
Eşitmişəm, zi əxbari-büzürgən.
Var idi kim məgər dər şəhri-Şirvan
Müəzzəm padşahi-dadgöstər,
Xərac ona verərdi yeddi kişvər[2].
Bəşər tələt, mələk sirət, kəm azar
Cavan mərdü, cahangirü cahandar.
Var idi bir qəmər tələtli oğlu,
Əgər görsə biri qalmazdı ağlı.
Yox idi misli, manəndi cahanda,
Məlaik[3] ona müştaq asimanda.
Təsəvvürdən onun birun cəmali[4],
Nəhayətdə fizun[5] əqlü kəmali.
Fəsihü qabilü şirinzəban[6] ol,
Fəqirü binəvayə mehriban ol.
Düzəltmiş bir neçə ali imarət,
Mühəyya daim onda nazü nemət.

---

[1] İki gözdən məhrum ola
[2] Ölkə
[3] Mələklər
[4] Təsəvvürə gəlməz qədər gözlədi
[5] Artıq
[6] Şirin dilli

Buyurmuş qullara ol xubkirdar,
Nə yerdə bir fəqirü binəva var,
Gətirin onları mehman sərayə,
Tərəhhüm eyləyin hər binəvayə.
Cahanda yaxşı adı oldu məşhur,
Gəlirdi hər fəqirü zarü məhcur[1].
Ona bir neçə gün olurdu mehman,
Qılardı hamıya ezazu ehsan.
Kim olaydı onunla həm təbiət,
Olurdu həmnişin, eylərdi söhbət.
Qılardı hər zamanda, yüz təvazö,
Bu rəsmi eyləmişdi xəlqə şaye.
Kim əyləşsə verərdi nazü nemət,
O kim gedər, verər əsbabü suali:
"Görübsüz mən təki sahib cəmali?
Mənim tək ola hüsnü xubü ziba,
Səhi sərvü səmənbuyü dilara?".
Deyərlərdi ki, haşa, sümmə haşa[2],
Sənə biz görmədik manəndü həmta[3],
Nəzirin yox cahanda, təksən taq,
Sənin hüsnünə Yusif ola müştaq
Zəhi surət, zəhi ziba[4], müsəvvər,
Təala şanəhü, Allahü əkbər!
Qəzara Misr şəhrindən bir oğlan,
Gəlib şahzadəyə ol oldu mehman.
Cavanü nazəninü xub rəna,
Süxəndanü vəcihü sərvü bala.
İkisi bir neçə gün sərfi-oqat[5],
Qılıb bir-birinə ol dəm mülaqat[6].
Pəs ol dəm, dedi şəhzadə, ki: ey yar!
Mənə manənd bu dünyada kim var?
Müsafirsən, cahani çox gəzibsən.

[1] Tanışlarından ayrı düşmüş
[2] Yox, heç yox
[3] Tay, bərabər
[4] Bu gözəllik, bu surət
[5] Yeyib içdilər
[6] Söhbət

Mənim tək kimsə dünyadə görübsən?
Kim ola mən təki sahib cəmali?
Cavabım ver, sənə qıldım sualı?
Dedi oğlan ki: ey nikü xəsayil,
Sənin tək görmədim sahib şəmayil[1].
Vəlakin şahi-Misrin bir qızı var,
Günəş tar olur[2], ol göstərsə rüxsar[3].
Cəmali-dilfərib[4], hüsni dilgəş,
Sənubər qaməti, şirin, məhvəş,
Kəman əbrü, səmən sima, güləndam,
Kəməndi-zülfi canlar mürqünə dam[5].
Saçı sünbül, qaşı yay, tir müjgan[6],
Alırdı işvə ilə neçə min can.
Vəfalı, mehriban, bir türfə dildar[7]
Cahani mütləqa qılmış giriftar.
Ona pəs aşiq oldu qayibanə,
Saraldı, rəngi döndü zəfəranə.
Könüldə qalmadı səbrü qərarı,
Pərişan müşkül oldu çünki halı.
Əsər qıldı ona hicranü firqət,
Tökər hər dəm gözündən əşgi-həsrət,
Rəvan olmuş gözündən əşgi-gülgün[8],
Başından getdi ağlı, oldu məcnun.
Atası oldu çün halindən agah,
Dedi: qəm yemə oğul, çəkmə gəl ah!
Verim gəncü xəzinə, külli vari,
Gətirim mən səninçün ol nigari.
Təsəlli tapdı pəs şahzadə Behzad
Atası sözlərindən oldu dilşad.
Buyurdu dər zaman ol mərdi-dana,

---

[1] Gözəl
[2] Tutulur
[3] Üz
[4] Ürək çalan
[5] Telləri könül quşuna tələdir
[6] Kirpikləri ox
[7] Misilsiz gözəl
[8] Qanlı göz yaşı

Vəzirlər qıldılar bir namə inşa;
“Ki, şaha! dövlətin olsun ziyadə,
Əlində daim olsun cami badə,
Sənə hər kimsə kim olmasa tabe,
Pərişan xatir olsun ömrü zaye.
Cahan yeksan[1] sənin fərmanın olsun,
Yamandan həqq sənin qalxanın olsun,
Başından sayeyi həqq olmasın kəm,
Olasan müttəsil xoşnudü xürrəm.
Lihaza ey xudavəndi yeganə!
Ümidim var, zi lütfü xosrövanə[2],
Kəminə quluvu xürsəndü mümtaz[3]
Qılasan şahi-aləm, sən sərəfraz.
Ki, vardır bəndəyə fərzəndi-dilbənd.
Ola sultanə qul, sultan xudavənd.
Qəbul edib ona gər versə duxtər[4]
Fədadır iş bu halda, can həm sər,
Cavahir, ləl, yaqutü xəzinə,
Əsasi səltənət, gəncü dəfinə,
Qəbul gər etməsən, bu sözü bizdən,
Kərəm qılıb keçər təqsirimizdən”.
Bəsi töhfə, təbərrük, barxanə,
Götürüb elçilər oldu rəvanə.
Yetişdi Misrə, ol fərxəndə qasid,
Çü məlum oldu məqsudü məqasid.
Səlahi-məmləkət gördü səvabin,
Geri yazdı yenə namə cəvabin.
“Əgər təqdir edibdir, həyyi-biçun[5],
Suvalsız gətirin siz yüz min altun[6].
Zəbərcəd və tila, firuzə, mərcan,
Nəhayət də fizun gəlsin firavan.
Qayıtdı elçi çün Şirvanə getdi,

[1] Başdan-başa
[2] Padşahın lütfü ilə
[3] Əskik qulunu sevindirib yüksəlt
[4] Qız
[5] Allah
[6] Qızıl

Gəlibən Misirdən sultana yetdi.
Əta qıldı şah ona, əsbü[1] camə[2],
Müşəxxəs oldu çün məzmuni-namə.
Qapısın açdı hər nə var, xəzayin[3]
Gətirdi zahirə, cümlə dəfain[4].
Var idi bir mürəsse[5], dürri məknun[6],
Vəlakin nəqdi-zər səksən min altun.
Nə kimi ol istəmiş, olmuş mühəyya,
Yenə oğlan qılır fəryadü qovğa.
Atası dedi: ey nuri-bəsirət[7],
Mənə on günə tək lütf eylə möhlət,
Dəxi sən qılam fəryadü fəqani,
Bəhəm yetirəlim baqi qalani[8].
Fəqan qılma dəxi bundan ziyadə,
Oğul, sən nik-nami vermə badə!
Vəlakin eşq bilməz nəngilə[9] nam,
Necə olur, nədir səbrü nə aram.
Olur aşiq olan bədnamü rüsva,
Olur aşiq olan bədnamü şeyda.
Yenə səbr etdi ol şəhzadə Behzad,
Qılardı naləvü zari və fəryad.
Pərişan oldu onun rüzgari,
Yenə qıldı fəqanü növhəzari.
Canında var, xəyalü vəsli canan,
Çıxıb bir gecə ol mədhuşü heyran.
Tutub dəştü[10] biyaban, rahü birah,
Gedər biçarə sərgərdanü gümrah.
Çəkib cövrü-cəfa həddən ziyadə,

---

[1] At
[2] Paltar
[3] Xəzinələr
[4] Qiymətli şeylər
[5] Naxışlı
[6] Sapa düzülmüş dürr
[7] Gözümün işığı
[8] Yerdə qalanı
[9] Utanmaq
[10] Çöl

Gəzərdi ol biyabanda piyadə.
Qəzara karvani-Misr məhmil[1]
Açıb ol yerdə etmişdilə mənzil.
Vəli gözlərinə getməzdi yuxu,
Çəkərlər oğrudan təşvişü qeyqu,
Oların gözlərinə çün göründü,
Nə gəldi başına sən gəl gör indi.
Tutub dedilər: ey sərməst[2], salus[3]!
Bizə bədxahsən! Ey düzdü[4] casus,
Yığıldı üstünə onlar tamami,
Bizə söylə hani düzdü hərami.
Ona eylədilər büsyar azar,
Giriftar oldu miskin, onda ağlar.
Onu salari-karvan[5] qıldı məhbus,
Belə apardı onu zarü məyus.
Atası oldu bu işdən xəbərdar,
Pərişanxatir oldu, zar ağlar.
Əlinə aldı çün ol dəmdə xamə[6],
Yenə sultani-Misrə yazdı namə,
"Ki, ey şahi-cahan, puştü[7] pənahim,
Ki, səndən qeyri yox ümidgahim!
Mənim fərzəndim ol şəhzadə Behzad,
Bu yerdə çün deyildi, xürrəmü şad.
Pərişan oldu onun rüzigari,
Yenə qıldı fəqanü ahü zari,
Həvayi-eşqidən biçarə oldu,
Bu yerdən baş alıb avarə oldu.
Bilirəm gəlmiş ol sizin diyarə,
Olur onda onun dərdinə çarə,
Bəzinharü, bəzinharü, bəzinhar[8],

[1] Yüklü dəvə
[2] Sərxoş
[3] Yaramaz
[4] Oğru
[5] Karvan başı
[6] Qələm
[7] Arxam
[8] Mütləq, mütləq, mütləq

Onun dərdindən olun siz xəbərdar".
Bu əhvalı eşitdi, çünki sultan,
Dedi: hər kim ki, saxlar onu pünhan,
Neçün sən eylə sərgərdanü gümrah,
Gəzirdin, yox idi biləncə həmrah?
Dedi Behzad ona hali sərasər,
Dedi pəs ona, ey sultani-sərvər,
Xəta qıldım, mənim əfv et günahım!
Belə bilməz idim, ümmidgahim.
Günahkaram, əta[1] eylə, kərəm qıl!
Mənə etmə təlafi[2], möhtərəm qıl.
Ayağından götürüb bəndi filhal,
Bəşarət verdi ona, qıldı xoşhal,
Müzəyyən[3] eyləyubən qıldı zinət.
Rəvan ol əyninə geydirdi xələt,
Dur indi gedəlim, şah istəyibdir;
Gətirsinlər mənə dərdəm", – deyibdir.
Gətirdi padşahın xidmətinə,
Dedi: ey padşahim: mən kəminə!
Bu oğlani məgər əndər biyaban,
Tutub dedim budur casus düzdan,
Əlin və ayağın mən bağlamışdım,
Giriftar eyləyibən saxlamışdım.
Eşitdim çün münadi[4] qıldı məfhum,
Mən ondan eylədim əhvali məlum,
Müşəxxəs oldu ki, damadi-sultan,
Gətirdim padşahim, budur oğlan!
Şəh ezaz eylədi ol dəm cəvanə,
Döyüldüyü təblü kusü[5] şadyanə,
Həm ol xacəyə qıldı lütf büsyar,
Görüb oğlanda hüsnü şəkli rüxsar,
Baxıb gördü, bəyəndi, dərhəmə bab[6].

---

[1] Bağışla
[2] Qisas
[3] Bəzədilmiş
[4] Carçı
[5] Böyük təbil
[6] Hər cəhətdən

Bilirdi onda yoxdur taqətü tab,
Buyurdu: siz çalın ol təblü kusi,
Mühəyya olsun əsbabi əruzi[1],
Çalındı təblü kus, nayi[2] zurna,
Qamu şəhrü vilayət oldu agah.
Dedi həm qaziyə, işbu səlahi,
Müşəxxəs etdilər əqdü[3] nigahi.
Bəli, çün axır oldu ruzi-hicran,
Yavuxlaşa nolaydı vəsli-canan.
Olur pəs, aşiqin şövqi ziyadə,
Yenə o şövqidən zövqi ziyadə.
Vəlakin ol gecə şahzadə Behzad,
Şüküftə xatirü[4], xürsəndü[5] dilşad.
Fəəmma[6] qalmamış səbrü qərari,
"Nihan görüm – dedi – bəlkə nigari?".
Bir evdə kim olurdu ol yeganə,
Yığılmış onda xubani[7]-zəmanə.
Pəri peykər, səhi qamət[8], səmənbər[9],
Qəmər tələtli, çox xurşid mənzər.
Qamu püstədəhan[10], şirin şəkər ləb,
Qamu laləüzarü, sib qəb-qəb[11],
Məgər Behzad gizlin çıxdı gecə,
Ol ev üstündə vardı bir dəriçə[12].
Oradan çün nəzər qıldı nigarə,
Görüb canan üzünü aşikarə.
Sanasan getdi ondan əqlü iman,
Baxan qaldı ona mədhuşü heyran,

---

[1] Toy dəsgahı
[2] Ney
[3] Kəbin
[4] Şən
[5] Sevincli
[6] Lakin
[7] Gözəllər
[8] Ucaboy
[9] Yasəmən
[10] Püstə ağızlı
[11] Alma buxaqlı
[12] Kiçik qapı

Baxıb onu məgər gördü bir övrət,
Qızın anasına qıldı işarət.
Gör indi neylədi ol bədfəali[1],
Əyan eyləmədi bu gizli hali!
Var idi ikiuclu bir dəmir şiş,
Oda qoydu onu bəd fel, bədkiş.
Qızardı çün ayağa durdu ol zən,
Ələ aldı, yeridi, suyi-rozən[2],
Deyil oğlan xəbərdar işbu halə,
İki gözünə şiş oldu həvalə.
Yıxıldı dər zəmin şahzadə Behzad
Çəkib nərə qılıb əfqanü fəryad,
Eşitdi xəlq fəryadü fəqani,
Yıxıldı dərzaman tapşırdı cani.
Bu halə vaqif oldu şahü ləşgər,
Sanasan ol zamanda qopdu məhşər.
Qoyub rəhmani çün vəsvasə[3] döndü,
Onun çünki toyu bir yasə döndü.
Əgər qılsaydı bir əndək təhəmmül,
Olurdu mətləbü məqsud hasil.
Çü səbr eyləmədi biçarə oğlan,
Kimə nə etdi, özünə qıldı nöqsan.
Yetərdi, səbri qılsa müddəayə,
Şitab uğratdı dərdü-bidəvayə[4].
Gecə oldu bu nəğl olunca təqrir,
Yenə ol Bəxtiyar boynunda zəncir,
Apardılar onu zindanə dustaq,
Onunçün yox havadar, el və oymaq.

---

1 Yaramaz adam
2 (divardakı) deşiyə tərəf
3 Şeytan
4 Dərmansız dərd

## BEŞİNCİ VƏZİRİN PADŞAHIN YANINA GƏLMƏSİ

Gecə keçdi, yenə çün oldu səbah,
Vəziri pəncümi[1] fəryadü ilhah[2].
Gəlib dedi ki: ey şahi-zəmanə!
Neçin yaxşılıq eylərsən yamanə?
Biri çün həqqi nemət eylədi güm[3],
Sən ona neçün eylərsən tərəhhüm?
Mürüvvət eyləsə hər kim ilanə,
Sitəm eylər o məxluqi cəhanə.
Fəramuş eyləsə kim həqqi-nemət,
Ədalətdir ona qılmaq siyasət.
Əgər bədxah ola nəvvabü nayib[4],
Buyurmuş həqq onun qətlini vacib.
Necə sən saxlayasan Bəxtiyari!
Müqəyyəd mübtəla yox ixtiyari.
Dedi: sultan ona kim ey sərəncam!
Bizi sən eylədin rüsvayü bədnam.
Xəlayiq tənə eylər hər zamanda
Bizi mülzəm[5] edərlər hər məkanda.
Xilas olmaq sənə bir çarə yoxdur,
Sənə ölümdən özgə çarə yoxdur
Büküm-büküm səni peyvənd-peyvənd,
Kəsəm, səndən ala hər kim gərək pənd[6].

[1] Beşinci
[2] Təkid
[3] İtirmək
[4] Qulluqçu, məmur
[5] Susmağa məcbur olan
[6] Nəsihət

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-aləm!
Sənə tofiqi-həqq olsun dəmadəm!
Pənahində səni saxlaya yəzdan![1]
Yetişməsin sənə asibi[2]-dövran,
Sənə bədxah ola məcruhü xəstə,
Gələn düşmən qapuva dəstə-dəstə,
Əgər şah eyləmiş qəsdi-həlakim,
Mənim yoxdur ölümdən hiç bakim[3].
Ümidim vardır ol qadir ilahə,
Zəval olmuya hərgiz bigünahə.
Ki, məndən olmamışdır, işbu üsyan,
Mənə olur onun lütfi nigəhban[4].
Mənim bu işdə yoxdur çün günahim,
Xudavəndi-cahan olur pənahim.
Bu gün əhvali miskinü kəminə,
Bu bənzər dastani-Dadbinə.
Vəzirin birisi ol qıza töhmət,
Qılıb ol felidən çəkdi nədamət[5],
Vəziri işbu töhmət verdi badə,
Ol övrət aqibət irdi muradə,
Dedi sultan, necədir bu hekayət?
Bəyan eylə bizimçün, qıl rəvayət.

---

[1] Allah
[2] Zərər
[3] Qorxum
[4] Gözətçi
[5] Peşmançılıq

## BƏXTİYARIN DADBİN SƏRGÜZƏŞTİNİ NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-sərvər!
Yəqin hər kim cahanda xeyrin istər,
Ola eymən[1], qamü şərrü bəladən,
Vəli qurtulmuya, bədgu bəladən.
Olur öz felinə hər kim giriftar,
Bu sözə şahid işbu nəğlü göftar,
Eşitdim var imiş bir padşahi,
Nəhayətsiz onun gəncü süpahi.
Ona qoymuşlar idi Dadibin ad,
Vəli işi həmişə zülmü bidad,
Var idi həm onun iki vəziri:
Əsasi-səltənət həm dadigiri.
Birisi Ruzibəxt emali-dünya,
Birisi Karidanü[2] karfərma[3].
Məgər ol Rüzbəxtin bir qızı var,
Mələk heyran olur göstərsə rüxsar.
Mütərra[4] zülfü sümbül, qəddi şümşad.
Xəcil onun boyundan sərv azad.
Özü gül, ləbləri bal, ağzı püstə,
Əcəyib nazənin, rəna, xücəstə[5],
Vəli pərdənişin maməndi Bəlqeys,
Nədir heç bilməmiş təzvirü[6] təlbis[7].
Nə məşuqə nədir bilməz, nə aşiq,
Həmişə həqq ilə könlü müvafiq.
Bəqayət mömünü əhli-ibadət,
Yox idi özgə işi qeyri taət.
Bəsi pəhrizkar, əhli təqva,
Hamı təqva onunçündür mühəyya.

---

[1] Xatircəm
[2] İş bilən
[3] İş buyuran
[4] Ətirli
[5] Uğurlu
[6] Yalan
[7] Hiylə

Alır adabilə ol dəstəmazi,
Gecə-gündüz qılar beş vaxt nəmazi.
Güruhi-Fatimə, xatuni-rəna,
Tələbkari rzayi həqq-təala
Səlatinlər[1] ona oldu tələbkar,
Qılırdı dayə çün bu rəmzi izhar.
Deyərdi: məndə yoxdur eyşi-madər,
Havayi-eyşü işrət, meyli-şohər[2],
Atası çün eşitdi bu cəvabi,
Gələn elçilərə etdi cəvabi[3].
Hüzurunda qamu əşrafü əyan,
Buyurdu onlara ol dəmdə sultan.
Hamı siz dəxi olun bu səlahə,
Gətirin ol qızı əqdi-nigahə.
Qızın atası məclisdə rəvani,
Evə gəldi çağırdı dərzəmani,
Yanına gəldi ol sərvü səmənbər,
Dedi: – Ey nazənin, pakizə duxtər!
Mələk siyrət, səmən sima, pərizad,
Nola sultan kim ola bizə damad?
Dedi pəs dayəsinə: ey güləndam!
Bu sözə yox səlahim, olmazam ram,
Mənim işim həmişə zikrü taət[4],
Onun işi həmişə eyşü işrət.
Onun təbi mənə olmaz müvafiq,
Kiməm mən, kim olam sultanə layiq.
İkinci: var onun xatuni-kübra[5],
Neçə sərvü sənubər, qədd rəna,
Mənə sultan gər eylər iltifati,
Gəlir ol iltifat onlara qati[6],
Həsəddən bağlayarlar mənə böhtan,
Həlak edə məni qəhr ilə sultan.

---

[1] Padşahlar
[2] Ər istəmək
[3] Rədd etmək
[4] İbadət etmək
[5] Böyük qadını
[6] Ağır, xoşa gəlməmək

Dedi atasına əhvali dayə:
– Deyil razı qızın bu müddəayə.
Necə verdi atası dilnəvazi,
Qərəz bu sözə qız olmadı razi.
Vəzir eşitdi qızdan bu cəvabi,
Gəlib sultana həm verdi cəvabi.
Qəzəbləndi ona ol dəmdə sultan.
Bulub fürsət vəzir oldu girizan[1],
Buyurdu carçılar çağırdı, cari,
Gətirsinlər mənə ol nabikari[2].
Əcəb sözdür demiş, əhli-fərasat
Ki, hökmü hakimü, mərgi müfacat[3].
Eşitginən dəxi yoxdur əlaci,
Ki, zəhri-qatil olmaz ondan aci.
Tapıb gətirdilər dərdəm vəziri,
Başına vurdu sultan bir dəmiri.
Dağıldı başı onun dərzəmani,
Yıxıldı, həqqə təslim etdi cani.
Vəziri öldürüb apardı qızi,
Zərü malü qulamü həm kənizi.
Çü qız olmazdı naməşruə[4] razi,
Çağırdılar pəs ol dəm gəldi qazi.
Pəs ol dəm hakimi-şəri-peyəmbər,
Nigah etdi, riza aldi zidüxtər[5].
Çalındı təblü kusü nayü zurna,
Nə kim könlu dilər olmuş mühəyya.
Neçə gün çağ idi şahın damaği,
Xəbər gətirdilər kim gəldi yaği.
Buyurdu döydülər dərdəm nəqarə,
Xəbər göndərdi hər şəhrü diyarə.
Mühəyya qıldı fikrin, oldu azim[6],
Səfər etmək ona çün oldu lazim.

---

[1] Qaçqın
[2] Yaramazı
[3] Sürətli ölüm
[4] Kəbinsiz
[5] Qızdan
[6] Yola düşmək

Evin tapşırdı ol dəm Kardanə,
Dedi: ol məhrəm israri-xanə,
Bəzinharü, bəzinharü, bəzinhar,
Hərəm əhvalinə sən ol xəbərdar.
Olursa kimdə belə fikri napak,
Gözünə kül qoyasan, başına xak.
Zəhi bədxəhü bədbəxtü səlitə[1]
"Komaçi quyruğu tapşırdı itə".
Gör indi neylədi, ol rusiyahi[2],
Xəyalından keçər xeyli münahi[3].
Büründü başına eyşiylə sevda,
Qızın eşqiylə Məcnun oldu şeyda.
Əlindən getdi taqət ixtiyaşi,
Könüldə qalmadı səbrü-qərari.
Başından getdi əğlü-huşu tədbir,
Vücudi oldu xəstə, rəngi təğyir.
Nə xub demiş bu sözü ol süxəndan,
Ki, qalmaz eşq gizlin, mişk pünhan.
Qızın yanında bir məkkarə[4] övrət,
Rəvanə eylədi ol bisəadət.
Ki: cana, mən sənin eşqində zarəm,
Giriftarəm, pərişan ruzigarəm.
Mənim bağrıma hicran vurdu bir dağ,
Könül olmuş sənin dərdinə müştaq.
Sənin eşqindən oldum mən ciyərxun,
Necə kim Leylinin eşqində Məcnun,
Sənə mən mailəm ey qəddi şümşad,
Bə eyni öylə kim Şirinə Fərhad.
Mənim könlüm ələ al, ey səmənbər!
Tutaram ətəyindən ruzi-məhşər!
Yetirdi bu sözü məkkarə övrət,
Nihani ol nigarə, qıldı xəlvət.
Eşitdi bu sözü ol sərv qamət,

[1] Qiybətçi qadın
[2] Qaraüzlü
[3] Qadağan olmuş işlər
[4] Hiyləgər

Pəs ol dəlaləni[1] qıldı məlamət.
Dedi: – Ey bihəya, narast, napak,
Səni elçi edənin başına xak.
Gətirdin çün xəbər, apar cavabın,
Ona söylə kim, ey şərməndə, xain,
Səni derlər[2] ki, mərdi-kardansan!
Vəliyyü nemətə qılma ziyan sən.
Səninlə mən necə olum müvafiq?
Bu sözü söyləmək sənə nə layiq?
Əgərçi yox imiş səndə dəyanət,
Ərim evində mən qılmam xəyanət.
Vəlakin bu cəzadır Dadbinə,
Evin tapşırıb sən tək əminə?
Könüldən zaye eylə bu xəyali,
Unut əlbəttə bu fikri-məhali
Bu sevdani əgər tərk eləyəsən,
Sənin razin[3] dəxi faş etməzəm mən.
Gəlib övrət ona yetirdi peyqam[4],
Dedi: səninçün hasil olmadı kam,
Dediyindən vəzir oldu pəşiman
Dedi: halım nola eşitsə sultan?
Əgər çəksə mənim başıma ərrə[5],
Kəsib yüz parə qılsa zərrə-zərrə,
Necə kim, olmamışam parə-parə,
Gərəkdir bu işə tədbirü çarə.
Budur kim, eyləyəm mən ona töhmət,
Ki, bəlkə qurtulam, qalam səlamət.
Əgər çi eyləsəm qılsam təqafül[6],
Pəşimanlıq olar əlbəttə hasil.
Təqafül eyləmək surət bu halə,
Mənimçün əksik olmaz ahü nalə.

---

[1] Dəllal qadın (aradüzəldən)
[2] Deyirlər
[3] Arzu, ürək sözü
[4] Xəbər
[5] Mişar
[6] Qəflət

Qızın atasını ol gün ki, sultan,
Yetirdi qətlə, malın qıldı talan.
Var idi bir qulami-xubkirdar,
Gətirmişdi bəqarət[1] ol sitəmkar.
Qamu əsbabü mətbəx ona təhvil,
Qılıb vermişdi ənamü təhsil.
Pəs ol namərd, nakəs, bisəadət,
Ona ol qeyri həqdən qıldı töhmət,
Səfərdən Dadbin çünki qayıtdı,
Vəziri-Karidan pişvazə getdi.
Şahə səcdə qılıb etdi dualər,
Yükəş təhsin çox-çox mərhəbalər.
Nüzul eylədi sultan, tutdu təmkin,
Vəziri-Karidani gördü qəmgin.
Dedi sultan ki: ey piri-kühənsal![2]
Pərişansan, neçün şuridə[3] əhval
Sənin neçün müşəvvəşdir damağın?
Üzün gülməz, açılmaz heç qabağın[4].
Vəzir dedi ki: ey nayibeyi-fərz,
Qılam məhz sözüm nəvvabiyə ərz;
Mənə mane vəlakin tərsi-candır[5],
Əgər ərz etməyəm dəxi yamandır.
Məgər sultan mənimlə edə peyman,
Yetirməyə mənə azarü nöqsan.
Deyəcək bir sözüm vardır nihani,
Onunla qıldı şəh əhdü əmani.
Vəzir edər[6] kim, ey şahi-cahanə,
Səfər əzminə[7] çün oldun rəvanə,
Mənə nagah xəbər verdi bir övrət,
Ki, ey xacə budur, dərkünci-xəlvət[8].

---

[1] Talamaq (burada əsir etmək)
[2] Çox yaşlı qoca
[3] Kədərli
[4] Qaş-qabaq
[5] Can qorxusu
[6] Söylər
[7] Qərara gəlmək
[8] Bir xəlvət bucaqda (yerdə)

Hüzuri piş edib[4] xatuni-canan,
Biri-birinə söylər razi-pünhan.
Eşitdim bu sözü əndər nihani,
Nəzər qıldım tanıdım ol cəvani.
O oğlandır ki, siz mətbəxi təhvil,
Veribən eylədiz ənam təhsil,
Deyərdi qız ona kim: ey vəfadar!
Nə çəkdim mən sənin ucundan ey yar!
Atam evində sən məndən bəkarət
Apardın eylədin mənə xəsarət.
Yox idi məndə çün aini-duxtər[5],
Onunçün eyləməzdim meyli-şövhər
Mənim yolumda atam öldü nahəq,
Atadan dayəyə oldu məşəqqət.
Mənimçün eylədi ol məkri-ali[6],
Ki, sultan dəxi bilmədi bu hali,
Əziza, salü mah, hər ruzü hər şəb,
Mənim könlümdə vardır iki mətləb:
Biri oldur muradim, nazəninim,
Gecə-gündüz olasan həmnişinim.
Ki, səndən qeyrilə yoxdur qərarim,
Səninlə sərf edərdim rüzigarim!
İkinci atamı öldürdü çün şah,
Alaydım qanini mən inşaallah.
Yazığam, qoyma onda qala qanım!
Ki, səndən hasil olur hər muradım,
Bu işdə etmişəm bir fikri tədbir,
Əgər sən qılmasan ehmalü təqsir.
Sənə verrəm mən əndək zəhri-qatil,
Nihan şah aşına sən eylə daxil.
Eyə bir loğma, canı edə təslim.
Qız ona eylər idi belə təlim
Dedi oğlan: kim ey pakizə canan!
Bitər bu iş mənim əlimdə asan.

---
[1] Bir-birilə görüşüb
[2] Qızlıq isməti
[3] Böyük hiylə

Bir ara qoydular qövlü qərari[1],
Xəbərdar eylədim mən şəhriyari.
Bu sözü çün dedi, ol zişti[2], bədxu[3],
Cahan şah gözünə oldu qaranqu,
Qəzəbləndi, eşitdi bu kəlami,
Siyasət birlə öldürdü qulami.
Buyurdu xatuni pəs ol sitəmkar,
Atalar qələ bürcündən nükusar[4].
Dedilər ol zaman ərkani-dövlət,
Şəha! Bizdən qəbul eylə nəsihət!
Mürüvvət eylə, əl öldürmə övrət!
Deyil layiq, olur nöqsani-sirət[5],
Səlah oldur onu biabü-binam,
Aparıb qoyalar əndər biyaban[6].
Öz əli ola, onun öz yaxası,
Ölümdən bigüman olmaz xilası.
Qəbul eylədi şah bu iltimasi,
Ona geydirdilər köhnə libasi.
Apardılar onu giryanü nalan,
Buraxıb gəldilər əndər biyaban.
Yetişdi durmayıb məhbub, məqbul
Qılıb taət, pəs oldu həqqə məşğul.
Nəmazə durdi çün övrət səlami,
Kişi dedi: kim ey yari-girami,
Nə yerdən sən gəlibsən, ey pərizad?!
Nə kimsəsən, nədir, söylə sənə ad?
Dedi: görsə əgər məni sizin şah,
Olur çün ol zaman halimdən agah.
Xəbər gər verəsən, ala o sultan,
Sənə çox eyləyər, ənamü ehsan.
Qəzara padşah ol gün şikarə,

[1] Dilbir
[2] Çirkin
[3] Pis xasiyyətli
[4] Baş aşağı
[5] Sənə yaraşmaz
[6] Çölün ortasında

Çıxıb olurdu onda aşikarə.
Eşitdi bu sözü ol dəm şütürban[1],
Gedib sultana sarı ol şitaban[2],
Yetişdi, dedi: ey sultani-sərvər!
Burada əylənibdir bir səmənbər.
Əgər qılsan ona bir dəm nəzarə,
Dəxi sən mail olmazsan şikarə.
Eşitdi bu sözü ondan çü sultan,
Dedi göstər, dəlil oldu[3] şütürban.
Yetişdi şah, ona qıldı nəzarə,
Sanasan göydən enmiş mahiparə.
Nigarü nazəninü gülüzari,
Kim onu görsə qalmaz ixtiyari.
Bütü Çin, filməsəl, sərxeyli-xuban[4],
Xəcil olur, üzündən mahi-taban[5].
Güli-həmrayə[6] bənzər, hər yanaği
Sözüdür şəhd, şəhərdir dodaği.
Boyu sərvü sənubər, hüsnü göyçək,
Başından getdi əqli onu görcək,
Dedi sultan: sənə mən oldum aşiq,
Səni əqd edəlim şərə müvafiq.
Qəbul eylədi övrət, oldu razi,
Buyurdu şah dərdəm gəldi qazi.
Müvafiq şərə ol sahib səliqə,
Oxudu şah üçün ol dəmdə siqə[7].
Təsərrüf eylədi şah ol nigari
Mühəyya qıldı onunçün imari[8].
Kəcavə içinə əyləndi xatun,
Mürəsse[9] yanları, o rəngli altun,

---

[1] Sarvan (dəvəçi)
[2] Tələsik
[3] Yol göstərdi (bələdçi)
[4] Gözəllər başçısı
[5] On dörd gecəlik ay
[6] Qızıl gül
[7] Kəbin
[8] İmarətlər
[9] Daş-qaşla bəzənmiş

Buyurdu şah, çalındı şadiyanə,
Nişatu zövqilə oldu rəvanə.
Pəs ol dəm oldu sultan şəhrə daxil,
Muradü müddəasi oldu hasil.
Nə keçmişdi başından şəhrü təqrir,
Bəyan eylədi o, sultanə bir-bir,
Dedi: şah, olma qəmgin, çəkmə gəl ah!
Sənin dadın mən allam inşaallah.
Qamusun burada məcruh xəstə,
Gətirrəm, görəsən dəst bəstə.
Təlafi eylə gəl necə bilərsən,
Rəvadir onlara hər cövr qılsan,
Buyurdu dərzəman şahi-cahandar,
Süpahi cəm olub gəlsin nə kim var.
Nida qıldı münadi aşikarə,
Təmamən ləşgərə etdi işarə.
Sanasən zəlzələ düşdü zəminə,
Rəvan ol qəsd qıldı Dadbinə,
Süpahi-biədəd[1], ləşgər firavan,
Onun çox ölkəsini qıldı talan
Dedilər: Dadbinə, gəldi ləşgər,
Xərab oldu vilayət, qaçdı ellər,
Canına düşdü yüz ənduhü[2] qeyqu,
Qılıb fikri tədarük çıxdı qarşu.
Yetişdi bir yerə çün iki sultan,
İki yandan yeridi mərdi-meydan,
Çalındı təblü kusü nayü zurna,
Sanasan məhşər oldu, qopdu qovğa.
Süpahilər qanından doldu meydan,
Dilavərlər qılıb qan içrə qəltan.
Süpahi-Dadibin, məqhurü[3], mənkub[4],
Basıldı ol zamanda, oldu məğlub.
Tutuldu Dadbin oldu giriftar,

[1] Saysız qoşun
[2] Qəm, qüssə
[3] Əzilmiş
[4] Döyülmüş

Qamu ərkani-dövlət hər nə kim var,
Xəzinə, hər nə var, məskuk[1], məzrub[2],
Hərəmdə[3] kim ki var, məqbulü məhbub.
Apardı cümləsin, sultan bəqarət,
Xərabə qıldı eyvanü imarət.
Edib qəhriylə ol ölkəni viran,
Təmam əsbabü malin qıldı talan.
Edibən Dadibin mülkünü bərbad,
Qayıtdı pəs oradan xürrəmü şad.
Vəziri-Dadibin məcruhü[4], xəstə,
Giriftarü müqəyyəd, dəstə-bəstə[5],
Olub can qorxusundan rəngi təqyir,
Ayaqda kündə və boynunda zəncir.
Çəkib gətirdilər dövlətsərayə,
Dedi pəs padşah, ol məhliqayə:
Əlibağlı səninçün gəldi düşmən,
Qisas eylə, ona necə bilirsən!
Arada asdılar bir pərdə hayil[6],
Xuraman gəldi ol niku-xəsayil.
Qılıban pərdədən izhari-göftar,
Dedi: – Ey nakəsi-zalim sitəmkar!
Nəçün sən nahəq öldürdün atamı?
Alayim indi səndən intiqamı?
Məni rüsvay edib avarə qıldın,
Pərişan, binəva, biçarə qıldın.
Günah məndən nə gördün, eylə təqrir,
Eşitsinlər qamusun şərhü təfsir!
Eşitdi bu sözü çün ol sitəmgər,
Müşəxxəs qıldı kimdir ol səmənbər.
Dedi: ey məhliqa, xurşid-tələt![7]
Ki, haşa, görmədim səndən xəyanət.

---

[1] Sikkələr
[2] Pullar
[3] Hərəmxanada
[4] Yaralı
[5] Əlibağlı
[6] Maniə
[7] Günəş üzlü

Vəli bir söz eşitdim Kardandan,
Sənə zülm eylədim mən ol gümandan.
Vəzir edər[1]: mənim üzüm qarardır,
Deyəlim necə keçmiş macəradır!
Rəvan oldu səfər əzminə sultan,
Məni yoldan çıxardı hirsi-şeytan.
Mən ona elçi göndərdim bir övrət,
Məni, həm onu etmişdi məlamət.
Xəbər gəldi mənə, oldum pərişan,
Dedim bu sözü gər eşidə sultan,
Deyər bişəkk ona xatuni-dilbənd,
Kəsə sultan məni peyvənd-peyvənd,
Onunçün söylədim nahəq bu töhmət,
Ölümdən qurtulub, qalım səlamət.
Onu mən boyadım bu rəngi-buyə,
Vəli düşdüm özüm qazan quyuyə.
Vəzirin işlərin eşitdi çün şah,
Pəs ol xatun dedi: əlhəmdülillah.
Eşitdin müddəidən padşahim?
Mənim yoxdur bu dəvadə günahim?
Ziyadə oldu şahin xişmü kini,
Yetirdi qətlə dərdəm Dadbini.
Qisasın aldı ol dəm, ol vəzirin
Gözün oydu, əlin kəsdi əsirin.
Ayaqların vəzirin kəsdi cəllad,
Qılırdı naleyi-əfqanü fəryad.
Bunu görən deyərdi alsın ibrət,
Deməsin kimsəyə nahəq bə töhmət.
Qazarsa kimsə özgə qəsdinə çah,
Özü axır düşər ol çahə nagah.
Bəladən qalmaq istərsən səlamət,
Amandır, qılma sən kimsəyə töhmət.
Ziyan eylər özüçün zişt-kirdar,
Olur öz felinə axir giriftar.
Aparıb saldılar əndər biyaban,

---

[1] Söylədi

Siyasət birlə təslim eylədi can.
Yetişdi Karidan, ondan cəzayə,
Hənuz bur az idi, ol nasəzayə[1],
Bu söz məşhur idi, əndər cəhanə;
“Yaman hər kim edər, uğrar yamanə!”.
“Kimin ki, xəlqə dəyməz bir ziyani,
İki dünyadə görməz o yamani”.
Vəziri-Karidan tək inşaallah,
Yaman dərdə giriftar ola bədxah.
Cavanmərdi ki, qılmışdı, şəfaət,
Ona başdan-ayağə verdi xələt.
Ətavü lütf edib ənamü ehsan,
Onun əlinə verdi hökmü fərman.
İnayət etdi[2] mülki-Dadbini,
Onun pəs dövlət oldu həm qərini.
Yamanlıqdan olara etdi nöqsan,
Ol oldu yaxşılıqdan mirü sultan.
Özüçün olar, hər kim ola yaxşı,
Yamanə deməzlər heç yerdə yaxşı.
Yamanlardan, yamandaq ya ilahi!
Fədayi xəstənin sən ol pənahi!
Ayırma yaxşılardan ol fəqiri!
Ki, səndən qeyri yoxdur dəstigiri[3].
Dedi pəs Bəxtiyar: ey padişahim!
Mənim bu davadə yoxdur günahim!
Həqqin dərgahinə ümmidvaram,
Ölüm yoxdur mənə, mən rastkarəm[4].
Tamam oldu hekayət, oldu axşam,
Yenə də gün batıb çün oldu axşam.

---

[1] Yaramaz
[2] Tapşırdı
[3] Əlindən tutanı
[4] Düz adamam

## ALTINCI VƏZİRİN PADŞAHIN YANINA GƏLMƏSİ

Səhərgəh çün görünməz oldu əxtər[1],
Günəş doğdu, cahan oldu münəvvər,
Birisi gəldi dəxi ol vəzirin,
Yetişdi xidmətnə ol əmirin.
Dedi: ey padşahi-həft kişvər[2],
Eşitdim xəlqi-aləm belə söylər:
– Məgər yoxdur, şahın namusu, ari?
Nə üçün saxlayıbdır Bəxtiyari?
Qılıbdır onu zindanbanə[3] təslim,
Gər olsa padşahdan özgə hər kim,
Çəkərdi başinə bu dəmdə ərrə,
Kəsərdi ya ki onu zərrə-zərrə.
Ya öldür sən bu gün ol bihəyani,
Ya sən qətl eylə gəl, xəlqi-cahani.
Çü namü nəngü qeyrət oldu bərbad,
Gər öldürməzsən onu, sən eylə azad!
Eşitdi çün vəzirin sözlərini,
Ziyadə oldu şahin xişmü[4] kini.
Gətirsinlər dedi, qıldı işarə,
Qəzəbləndi, dedi ol Bəxtiyarə,
Dedi: – Ey Bəxtiyari-şumü bədbəxt,
Ədəbsiz, bihəya, bədnamü sərsəxt.
Sənə mən eylədim ezazü ikram,
Məni sən eylədin rüsvayü bədnam,
Bu gün təhqiq bil ey üzü qarə,
Sənə yoxdur ölümdən özgə çarə!

---

[1] Ulduz
[2] Yeddi ölkə
[3] Həbsxana başçısı
[4] Acıq

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-sərvər!
Cahan olsun sənin hökmündə yeksər![1]
Ümidim var xudavəndi-cahanə,
Səni uğratmasın hərgiz yamanə.
Dürüstdür həqqə ixlasü yəqinim,
Olur axır səadət həmnişinim.
Vəli mən bağlamışam həqqə ümmid,
Məni həqq eyləməz məhrümü nomid.
Mədəd qıldı yəqin Bəxtazimayə,
Necə yetirdi onu müddəayə.
Həqqə çün bağlamışdı sidq ilə dil[2],
Onunçün oldu asan kari-müşkül.
Dedi sultan ona, ol dəm: ki, oğlan!
Xəbər ver sən biz Bəxtazimadan!

## BƏXTİYARIN BƏXTAZİMA SƏRGÜZƏŞTİNİ NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi aləm!
Həmişə könlün olsun şadü xürrəm,
Məgər bir gün eşitdim mən diləfkar,
Rəvayət eylədi raviyi-əxbar,
Var idi ol zaman sultani-qafil,
Adı Bəxtazima, məğrurü cahil.
Həmişə mail olmuşdu şərabə,
Yetişməzdi hesabü bihesabə,
Onun ləhvü-ləəb[3] olmuş müdari,
Keçərdi qəflət ilə rüzigari
Özündən bixəbər, mədhuşü heyran,
Rəiyyət təfriqə[4], ləşgər pərişan,

---

[1] Başdan-başa
[2] Ürək
[3] Mənasız, laübali həyat
[4] Parçalanmış, dağılmış

Oturmuş qafilü, bifikrü eymən.
Onun üstünə gəldi taki düşmən,
Əlindən getdi onun ixtiyari,
Buraxdı qələvü şəhrü hasari.
Saluban gəncü malü xanımanın,
Qaçıb Bəxtazima qurtardı canın.
Onunla var idi bir neçə nökər,
Var idi sərhədində neçə ləşgər.
Buyurdu onlara siz edin ilqar!
İrakda[1] kim var isə edin ehzar[2],
Münasib yerdə çün əyləndi sultan,
Yığıldı üstünə ləşgər firavan.
Verirdi istimalət[3] çün hamuyə,
Gəlib durdu bərabər ol əduyə[4].
Yeridi hər tərəfdən çün ələmlər,
Biri-birinə çün əl açdı ləşgər.
Döyüşdü qeyrət ilə pəhləvanlar!
Yeridi iki yandan mövc[5] qanlar.
Təvəkkül etməmişdi çün qəzayə,
Şikəst uğradı ol Bəxtazimayə,
Basıldı ləşgəri ol dəm hərasan,
Libasü malü ziynət oldu talan.
Tərəhhüm eyləməyən binəvayə,
Yəqin bil yetməzmiş müddəayə,
Özüçün kim qazanır ahü nifrin,
Həmişə ola o, məhzunü qəmgin.
Ayağa düşənin ol dəstigiri,
Təvazö birlə şad et hər əsiri.
Girizan oldu düşməndən nihani,
Bu vəchilə yenə qurtardı cani.
Qaçıb ol mülküdən avarə oldu,
Qəribü bikəsü avarə oldu,
Qəribü bikəsü avarə oldu.

---

[1] Uzaqda, kənarda
[2] Çağıran
[3] Öz ətrafına qüvvə toplamaq
[4] Düşmən
[5] Dalğa

Nə bir yoldaş, nə bir munis, nə bir yar,
Yetişdi gördü türfə şəhri büsyar.
Həm ol şəhrin müəzzəm padşahi,
Var idi ləşgəri, xeyli süpahi.
Yeriyib, dedi: ey sultani-sərvər!
Nolur ki, mən olum sultanə nökər!
Qəbul eylədi sultan, oldu nayib,
Müqərrər oldu ənamü məvacib.
Vap idi qabiliyyət çün zatində,
Müqərrəb oldu şahin xidmətində
Üzü gülməz, vəli könlü açılmaz,
Onun əhvalini heç kimsə bilməz.
Yox idi bir zaman səbrü qərari,
Gecə ağlar idi eylərdi zari.
Eşitdi birisi əhvali-zari,
Xəbərdar eylədi ol şəhriyari,
Çağırdı dər zaman şah ol cəvani,
Dedi: söylə mənə razi nihani!
Dedi: – Sultan, sanırsan bir gedayəm?
Ki, mən şahi-cahan Bəxtazimayəm.
Deyildim mən xəbərdar, ey şahənşah!
Mənim üstümə düşmən gəldi nagah,
Mənə bəxtü səadət olmadı yar,
Ki, mən məğlub, qalib oldu onlar.
Şikəst oldu mənə, talandı malım,
Əsir oldu qamu əhlü əyalım.
Dedi Bəxtazima, sultana çün raz,
Yenə sultan ona ikramü ezaz,
Qılıban dedi sultan: inşallah,
Süpahım hər nə var, səninlə həmrah[1],
Edibən vuralım təblü nəqarə,
Rəvan səni edim mən ol diyarə.
Sənə yoldaş edib ləşgər təmami
Alasan düşmənindən intiqami.
Nəfirü xeyməvü xərgahü fərraş
Qamu Bəxtazimayə qıldı yoldaş.

[1] Birlikdə

Rəvanə qıldı getdi ol diyarə,
Vəli olmaz imiş təqdirə çarə.
Qılır hər kim ki, cidd-cəhd, büsyar,
Nə hasil, olmasa dövlət əgər yar.
Əgər yar olmaz isə bəxtü tale,
Olur bifaidə ol səyü zaye.
Xəbər yetişdi çün ol nasəzayə,
Müqabil durdu ol Bəxtazimayə,
Savaş düşdü arayə iki yandan,
Boyandı lalə tək yer üzü qandan.
Pəs ol dəm bəxtü tale, gör nə qıldı?
Yenə Bəxtazima ol dəm basıldı,
Basıldı ləşgəri, oldu girizan[1],
Özü yalqız qalıb tərsanü lərzan.
Pərişan hali, bağrı parə-parə,
Özün yetirdi bir dərya kənarə,
Qəzara hazır idi, onda məllah,
Təzərrö[2] eyləyib çün qıldı ilhah.
Pərişan, müztərib, cövri-ədudən,
Girib kəştiyə ol dəm keçdi sudən,
Gəmidən çıxıban bir şəhrə yetdi,
Təvəccöh eyləyib, sultanə getdi.
Dedi: şaha! Qəribü binəvayəm,
Eşitmiş olasız, Bəxtazimayəm,
Bəyan eylədi hamı sərgüzəştin,
Dedi sultan ona: sən olma qəmgin!
Həmişə sən bizimlə həmnişinsən.
Qəmü ənduhü möhnətdən əminsən.
Şah ona eylədi ezazü ikram,
Bəsi lütfü bəsi ehsanü ənam.
Gecə-gündüz şah ilə həmdəm oldu,
Qamu sirri nihanə məhrəm oldu.
Deyildi əskik ona nazü nemət,
Yenə gəldi ona iqbalü nemət.

---

[1] Qaçqın
[2] Yalvarmaq

Qalıb əyləndi onda ruzigari,
Keçərdi işbu növ ilə müdari.
Qəzara bir gün əylənmişdi ol şah,
Xəbər oldu ki, düşmən gəldi nagah,
Qayırdı ləşgərin, oldu rəvanə,
Onu qarşıladı şahi-zəmanə.
Çalındı kərana[1] cəm oldu ləşgər,
İkisi bir-birə durdu bərabər.
Qərivü qülqülə[2] düşdü cahanə,
Boyandı yer üzü ol gündə qanə.
Müxalif ləşgərindən gəldi bir ər,
Əlində nizə, belində xəncər,
Suvar olmuş səməndi-bad rəftar[3],
Dilavər, pəhləvan, mərdanə, cərrar[4],
Çağırar: ər olan meydanə gəlsin!
Müxənnət gəlməsin, mərdanə gəlsin!
Bu gün meydan içində əjdəhalər,
Mənə şirü pələng olmaz bərabər.
O dəm vurdu özün qəlbi süpahə,
Qamu ləşgər kömək eylədi şahə,
Sınıb ləşgər ələm oldu nikunsar,
Qırıldı ləşgəri-düşmən, nə kim var.
Basıldı ləşgəri, talandı sərdar,
Kisb[5] eylədi hər kim mali-büsyar.
Dedi Bəxtazima ol dəm ki, ey şah!
Süpər[6] oldu qəzadən sənə Allah.
Deyil cəng eyləmək, sərdarə layiq,
Bu tədbir olmaya əqlə müvafiq,
Necə oldu nişani-tirü şəmşir,
Xilafi əqlidi bu rəyü tədbir.
Durub bir yerdə sən tut istiqamət,
Savaşü cəng edə ləşgər təmamət,

---

[1] Böyük şeypur
[2] Səs-küy
[3] Yel kimi iti gedən at
[4] Qüdrətinə inanıb ahəstə yürüş edən əsgər
[5] Qənimət
[6] Qalxan, dayaq

Dedi sultan kim, ey yari vəfadar!
Səninçün şərh edim bir gizli israr,
Həmişə eylərəm həqqə təvəkkül,
Onunçün görməzəm düşvarü[1] müşkül.
Mənim ixlasimə həm bir səbəb var:
Səninçün nəğl edim, sən eylə izhar!
Keçən illərdən ey gözüm çirağı!
Mənim üstümə gəldi ta ki, yağı,
Var idi məndə ləşgər, bişümarə[2],
Onu əndək görüb etdim nəzarə.
Mən oldum öz gücümə çünki məğrur,
Basıldım ol zaman mənkubü məqhur.
Dağıldı ləşgərim, oldu girizan,
Ədu əsbabü malim qıldı talan.
Qaçıb mən dəxi çıxdım bir diyarə,
Mənim düşdü yolum bir kuhisarə[3].
Çü görmüşdüm elə bir rüzgari,
Qılırdım növheyi-əfqanü zari.
Gəzərdim hər zaman şuridə əhval,
Göründü gözümə nakəh, bir əbdal[4],
Bəqəyət xişmigin[5], heybətli dərviş,
Dedi: ey binəva, miskinü dərviş,
Kimin əlindən işbu dadü bidad,
Qılırsan naleyi-əfqanü fəryad?
Ona şərh eylədim mən çünki əhval,
Cavab verdi mənə ol dəmdə əbdal.
Olubsan öz gücünə çünki məğrur,
Səni həqq eyləmiş məğlubü məqhur.
Təvəkkül etmiş onlar kirdigarə,
Veribdir fürsəti Allah olarə.
Gər istərsən ola dərdinə çarə,
Yeri, eylə təvəkkül kirdigarə.

---

[1] Çətinlik
[2] Saysız
[3] Dağlıq yer
[4] Dünyadan əl çəkmiş dərviş
[5] Acıqlı

Xudadan istə tofiqü inayət,
Qərin ola sənə aşüftə dövlət.
Yeri, həqq ilə sən qıl əhdü peyman,
Bunu deyib gözündən oldu pünhan,
Pəs ol gündən bəri, həsbül-işarə[1],
Yəqinim bağlamışam kirdigarə.
Olursa hər kimə tofiqi-həqq yar.
Olur asan ona hər kar düşvar.
Könül verdim çü mən bu etiqadə,
Qayıtdım dər zaman, irdim[2] müradə.
Kimə yoldaş ola tofiqi-yəzdan[3],
Ona kar eyləməz, şəmşiri-bürram[4].
Yeri, sən həqqə bağla sidqi-ixlas,
Könüldən xali eylə fikri vəsvas.
Gər istərsən muradın ola hasil,
Könül bağla həqqə sən olma qafil.
Dürüst olsa həqq ilə etiqadın,
Olur hasil sənin bişəkk muradın.
Əsər qıldı bu söz Bəxtazimayə,
Təvəccöh eylədi ol dəm xudayə,
Olub guşənişin, məşğuli-taət,
Qərin ola sənə iqbalü dövlət.
Ziyadə oldu ixlasü yəqini,
Səadət oldu onun həmnişini[5].
Ona kəşf oldu israri-nihani,
Könüldə qalmadı mütləq gümani.
Düşində[6] dedilər Bəxtazimayə,
Təvəkkül eylədin çün sən xudayə,
Müqərrər eylədi həqq sənə fürsət.
Sənə verdi bu gündə malü nemət.
Yeri get şəhrə sən qılma təqafül[7],

[1] Edilmiş işarə əsasında
[2] Çatdım
[3] Allah
[4] Kəsərli qılınc
[5] Dostu
[6] Yuxusunda
[7] Fürsəti əldən vermə

Sənə mətlubü məqsud oldu hasil.
O dəmdə yuxusundan oldu bidar[1],
Həqqin dərgahına şükr etdi büsyar.
Sabah olcaq durub oldu rəvanə,
Yetişdi əz qəza çün ol məkanə.
Məgər ol gün hamu əşrafü əyan,
Çıxıb gəştə[2] olar eylərdi seyran.
Olara yetdi qıldı həmzəbanlıq,
Təvazö eylədilər, mehribanlıq.
Dedilər: ey cəvanmərd, aşinasan,
Əcəb olmuya sən Bəxtazimasən?
Dedi: bəli, güman vardır bəhər hal,
Qamu xoşnud, şakər[3] oldu xoşhal.
Ayağına hamusu düşdü bir–bir,
Dedilər: bizdə yox cürmü[4] təqsir.
İnayət eyləyib əfv eylə, ey şah!
Üzün gördük sənin əlhəmdülillah!
Gətirib gəldilər Bəxtazimani
Gecə daxil olub şəhrə təmami.
Əkabirlər[5] qamusi etdi beyət
Vəzirü həm vəkil, ərkani–dövlət.
Çü tutdular gecə onun qənimin[6],
Sitəmdən, zülmüdən xəlq oldu əmin.
Hökumət etdi çün Bəxtazimayə,
Yəqinindən[7] yetişdi müddəayə.
Olursa hər kişidə siqdi–ixlas,
Ona yol bulmaya şeytanü vəsvas.
Mənim yox həqqidən özgə pənahim,
Təvəkkül etmişəm, mən padşahim.
Onun dərgahinə ümidvaram.
Mən axır bu bəladən rəstkaram[8].

---

[1] Oyanmaq
[2] Gəzməyə
[3] Şükür edən
[4] Günah
[5] Kübarlar
[6] Düşmənin
[7] İnandığı üçün
[8] Xilas olmuş

Fədayi, sən təvəkkül qıl xudayə,
Yetərsən inşallah müddəayə.
Tamam oldu bu dastan, getdi sultan,
Məkanı Bəxtiyarın oldu zindan.

## YEDDİNCİ VƏZİRİN PADŞAHIN YANINA GƏLMƏSİ

Səhər oldu, günəş göstərdi tələt,
Vəziri həftüminə[1] yetdi növbət.
Gəlübən dedi: ey sultani-kamil!
Gərəkməz bunda təqsirü təqafil,
Haçanatən bu bədbəxt ola məhbus?
Məgər yox səndə şaha, arü namus?
Məni öldür ki, nöqsan oldu sirət[2],
Xudavənda, hanı şərti mürüvvət?
Bunu öldürməyin eyni mətalib[3],
Yenə sultanə qeyrət oldu qalib.
Gətirsinlər, – deyib qıldı işarə,
Qəzəbləndi dedi, ol Bəxtiyarə:
Kim, ey bədəsl[4], nakəs, dunü[5] əbtər[6],
Bu gün oldu sənə ölmək məqərrər.

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-aləm!
Başından sayeyi-həqq olmasın kəm[7].
Mürüvvət eylə, tünd olma fəqirə!
Siyasət eyləmə mən tək fəqirə.

---

[1] Yeddinci
[2] Üzüqaralıq
[3] Məqsədəuyğun
[4] Nacins
[5] Səfil
[6] Alçaq
[7] Əskik

Əgərçi qulların işi xətadır,
Böyüklər şivəsi əfvü ətadır.
Mənim əfv eylə cürmüm, ey cavanmərd!
Necə kim əfv qıldı şah Behkərd,
Bağışladı onun cürmün tamami,
Xəta qılmışdı onun bir qulami.
Dedi sultan kim, ey bürnayi-pürdərd[1],
Nə qıldı qul, necə əfv etdi Behkərd?

## BƏXTİYARIN BEHGƏRD ŞAHIN SƏRGÜZƏŞTİNİ DANIŞMASI

Eşitdim, var idi bir padşahi,
Nəhayətsiz onun xeyli süpahi.
Süxən təbü[2] hünərməndü cəvanmərd,
Şücaü[3] pəhləvanü şah Behgərd.
Qəzara bir gün ol şahi-nikukar[4],
Ova çıxdı belə ləşgər, nə kim var.
Məgər bir qul ox atırdı şikarə,
Qəzara getdi dəydi şəhriyarə.
Götürdü şahi Behgərdin qulağın,
Müşəvvəş eylədi şahın dəmağın.
Töküldü üstünə şahın qızıl qan,
Onu ləşgər görübən qıldı əfqan.
Müşəxxəs etdilər oxdan nişanı,
Tutub gətirdilər ol növcavanı.
Buyurdu şah dərdəm, gəldi cəllad,
Pəs oğlan yalvaruban qaldı fəryad:
– Rəva görmə sitəm, mən bipənahə,
Ki, mən qəsd etməmişəm padşahə.
Rizayi-həqq ədalət eylə mütləq,
Yazığam, sən məni öldürmə nahəq

---

[1] Çox dərdli gənc
[2] Söz bilən
[3] Cəsarətli
[4] Xeyirxah

Kərəm eylə, xəta qıldım, əta qıl,
Məni azad, əzbəhri-xuda[1] qıl,
Fəda olsun sənin yolunda canım,
Gər öldürsən, qalır boynunda qanım.
Ədalət eylə şaha, olma zalım!
Bu gün rəf eylə boynundan vəbalın
Ki, sultan gördü onun suzi-ahin,
Kərəm qıldı, bağışladı günahin.
Gəl indi vaqif ol sən, bu xəbərdən,
Kim idi ol cavan, əsli nə yerdən?
Vəzir imiş onun atası dirlər[2],
Əlində müttəssil divanü dəftər.
Bir özgə şəhr, özgə məmləkətdən,
Həmişə dadgiri, səltənətdən,
Vəlakin ol diyarın padşahi,
Talardı peyvəstə[3] ol bigünahi.
Cəfacu[4] tündxu[5], zalim, sitəmgar,
Qılırdı ona nifrin, hər nə kim var.
Qamu azürdə ondan mirü[6] ləşgər,
Əlindən təngə gəlmiş şəhr yeksər,
Tifaq[7] eylədi pəs əyanü əşraf,
Ki, yoxdur padşahda ədlü insaf.
Aradan götürəlim ol əmiri,
Yerinə nəsb edəlim ol vəziri.
Qəbul eylədilər bu sözü bari[8],
Gecə öldürdülər, ol nabikari[9].
Vəzir oldu onun yerində sultan,
Qayırdı ləşgərin, çox etdi ehsan.
Götürdü məmləkətdən zülmü bidət,

---

[1] Allah yolunda
[2] Belə deyirlər
[3] Həmişə
[4] Zülm edən
[5] Xasiyyəti pis
[6] Zabit
[7] Birləşmək
[8] Hamısı
[9] Zalimi

Fəraqat tapdı dövründə rəiyyət.
Neçə il almadı mali-cəhati[1],
Fəramuş eylədi eyşü nişati.
Anardı[2] oğlunu o, ah edərdi,
Hər iqlimə ki, bazırgan gedərdi.
Sifariş eylər idi ona izhar,
"Mənim oğlumdan olarsız xəbərdar".
Yenə çox kimsə qılmışdı rəvanə,
Ki: "Hər kim gətirə ondan nişanə,
Verərəm ona mülkü mal, büsyar,
Onu mən eylərəm ləşgərə sərdar".
Xəlayiq bu xitabi çün eşitdi,
Onu istəməyə çox kimsə getdi.
Təfəhhüs[3] eyləyib gedərdi bir mərd,
Yolu düşdü bəşəhri şahi-Behgərd
Gəzərdi, gördü nagah, ol cavani
Vəzirdən çün eşitmişdi nişani.
Qiyas[4] ilə onu tanıdı fil-hal[5].
Sevindi, şad, şakər oldu, xoşhal.
Ayağına düşübən oldu xəndan,
Ona pəs ol zamanda dedi oğlan;
Dedi: gəl görəlim sən aşinasən,
Bizim ilə haçandan aşinasən?
Səbəb bilməm nədir ey əhlü hümmət?!
Mənimlə qıldın izhari-məhəbbət?
Yetişdin zahirən indi səfərdən,
Nə yerlisən, gəlirsən, de nə yerdən?
Kişi bir xəlvətə qıldı işarət,
Dedi: gətirmişəm sənə bişarət[6],
Vəzir idi atan, oldu şəhənşah,
Səninçin diləyir hər gündə yüz ah.

---
[1] Vergi
[2] Xatırlardı
[3] Axtarmaq, tədqiq etmək
[4] Müqayisə etmək
[5] O saat
[6] Şad xəbər

Veribdir malü nemət, zər də büsyar,
Müsafir oldular sənə tələbkar.
Xəbər verib demişdi ol yeganə,
Çü zahir səndə gördüm ol nişanə.
Tanıdım mən səni əlhəmdülillah.
Dedi oğlan ona: ol gəl, sən agah!
Mənəm bu şahi Behgərdin qulamı,
Necədir, görməmişəm mən atamı?
Dedi kişi: eşit təhqiq, doğru,
Gətirib səni satmış ona oğru.
Gəl ey Yusif, bu gün Yəqubi-zarə,
Tərəhhüm eylə, qıl dərdinə çarə!
Atayə ey igid, püştü[1]-pənah ol!
Otur təxtə, yerində padşah ol,
Bu sözü ondan eşitdi, çü oğlan,
Münasib yerdə onu qıldı pünhan.
Kəsildi səbrü aramü qərari,
Gecə gəldi o dəm oldu süvari.
Dəlil oldu kişi ardınca oğlan,
Gecə-gündüz gedərdilər şitaban[2],
Mübəddəl[3] çün visalə oldu hicran,
Atası gördü oğlan şadü, xəndan.
Sanasan ölmüş idi gəldi cani,
Yetişdi Xizrə abi-zindəgani[4]
Sanasan bülbül etdi seyrü gülzar,
Kişiyə verdi malü mülk-büsyar.
Ona çox eylədi ikramü ezaz,
Xəlayiqdən onu qıldı sərəfraz.
Gəl indi sən qulaq ver, ey cavanmərd!
Necə oldu eşit, əhvali-Behgərd.
Məgər kim çıxdı ol seyri-şikarə,
Yəqin bil yoxumuş təqdirə çarə.
Yel əsdi binəhayət, oldu tufan,

---

[1] Arxa, kömək
[2] Sürətlə
[3] Əvəz
[4] Dirilik suyu

Sanasan gecə-gündüz oldu eksan.
Hava oldu müxalif, tünd, xeyrə[1],
Çıxar gərduni[2] dunə xaki-tirə.
Günəş tutuldu, aləm oldu zülmat,
Pəs ol ləşgər qamusu oldular mat.
Cahan oldu qaranqu, tirevü tar,
Qalıb hər kimsə öz halına naçar.
Baş alıb getdi hər kəs bir diyarə,
Yetişdi şah bir dərya kənarə.
Səlamət qurtulub ol rəstixizdəm[3],
Gəmiyə oturub keçdi dənizdən.
Dənizdən keçdi, yetdi karivanə,
Həm oldular olar şəhrə rəvanə.
Kim ol qul olmuş idi, onda sultan,
Rəfiq olub gedər iftanü xizan.
Giribən şəhrə getdi suyu bazar[4],
Ki, axşam oldu onda yatdı naçar.
Kəsər ol gecə oğru bir dükani,
Əsəs[5] gördü tanıdı ol cavani.
Çü bildilər qəribdir, ol cəvani,
Tutuban qolların bağladı ani[6].
Rəvani tutuban bağladı möhkəm,
Apardılar onu sultanə dərdəm.
Ki: şaha, işbu nakəs, düzdü tərrar[7],
Dükan kəsmiş, aparmış mali-büsyar.
Buyurdu döydülər çox binəhayət,
Ona eylədilər çox-çox siyasət.
Qamu barmaqlarından axdı qani,
Yavuq oldu bədəndən çıxa cani.
Tərəhhüm eyləyən yox, gördü naçar.

[1] Qaranlıq
[2] Göylərə
[3] Fəlakətdən
[4] Bazara tərəf
[5] Gecə qaraulçusu
[6] O saat
[7] Hiyləgər oğru

Ölümdən yey[1] onunçün qalmadı ar.
Buyurdu vurdular Behgərdi bəndə,
Ayağında səlasil[2], əldə kündə.
Çü ol dəmdə giriftar oldu, Behgərd.
Qərib oldu onunla möhnətü dərd.
Anardı çünki keçmiş ruzgari,
Qılardı naleyi-əfqanü zari.
Nə bir munis, nə bir yoldaş, nə bir yar,
Canından şahi-Behkərd oldu bizar.
Məqam oldu ona qəmxanə, miskin,
Bacaya qondu nagəh, bir göyərçin.
Ələ bir daş alıb ol əhli hümmət,
Məgər könlündə qıldı belə niyyət:
Əgər mən daş ilə vursam bu quşi,
Fəramuş eylərəm ahü xruşi.
Oluram bigüman, zindandan azad.
Qəmim axir ola, ollam xürrəmü şad.
Görəm bir də yenə əhlü əyali,
Hökumət, səltənət, cahü cəlali.
Əgər rədd ola, ona dəyməyə daş,
Qəmu əndüh ola mənimlə yoldaş.
Qalam zindan içində zarü məhcur[4],
Olam bədnamü rüsvay, xəlqə məşhur.
Əsiri mübtəla, qallam giriftar,
Ola təslim canim axirikar,
Fəraq əl verdi, gözdən tökdü yaşı,
Bu fikr ilə əlindən atdı daşı.
Qəza gör netdi[5], təqdiri-ilahi,
Ova gedirdi şəhrin padşahi.
Qəza ru etdi[6] daş dəydi o şahə,
Yıxıldı şah düşdü xaki-rahə.

---

[1] Üstün
[2] Zəncir
[3] Dəxi
[4] Ayrılıq
[5] Nə etdi
[6] Üz verdi

Götürüb zərb ilə şahin qulağın,
Pəs ol dəm çəkdilər qullar çomağın.
Gətirdilər onu boynunda zəncir,
Dedilər şahə: bundadır bu təqsir!
Ona eylədilər tənbihü azar,
Qəribü binəvayə yox havadar.
Bu bədbəxt idi kim atdı daşi,
Dükani kəsdi, apardı qumaşi.
Oğurluq eyləmiş həddən ziyadə,
Veribdir bir qulaği dəxi badə.
Buyurdu qullara şah aşikarə,
Boğazından asalar onu darə.
Dedi pəs şah, Behgərd: ey xirədmənd[1],
Məni öldürmə, nahəq, ey xudavənd.
Oğurluq bilməzəm, mən bigünahəm,
Ki, mən həm bir diyarə padşahəm.
Məgər çıxmış idim, bir gün şikarə,
Mənim onda qulağım oldu parə,
Atardı bir qulum bərqəsdi nəxcir[2],
Qulağım düşdü nagəh, dəydi çün tir.
Ağasın tanıdı ol dəmdə oğlan,
Ayağın öpdü, oldu zari-giryan.
Atası dedi: ey oğlan bu kimdir?
Tanırmısan və ya könlün rəhindir?
Dedi: oğlan yəqin bil, bu cavanmərd,
Mənim ağam budur, ol şahi-Behgərd.
Mənim tək var onun yüz min qulami,
Cahani tutmuş onun nik nami[3].
Məkani-elmü, helmü, bəhri-insaf,
Mürüvvətli, həyali, əhli insaf.
Mən atdım ox ova, bərqəsdi nəxcir,
Qulağı düşdü nagəh, dəydi çün tir.
Məni tutub gətirdilər, həm ol dəm,
Mənimçün ruzi-behcət[4] oldu matəm.

[1] Ağıllı
[2] Dağ keçisini vurmaq məqsədilə
[3] Yaxşı adı
[4] Şadlıq günü

Qılırdım naleyi-əfqanü fəryad,
Məni pəs şah ol dəm qıldı azad.
Hamu təhsin dedilər şəhriyarə,
Nəsib oldu mənə ömür dübarə.
Bu halə çün atası oldu agah,
Məlik Behgərd əlindən öpdü ol şah.
Kərəm qıl, qılma bizdən cürmü təqsir,
Vəlakin yox imiş təqdirə tədbir.
Gecə-gündüz ona ənvai izzət[1],
Özü, oğlu ona eylərdi xidmət.
Mühəyya oldu məclis, noğlü[2] badə,
Təvazö eylədi həddən ziyadə.
Ona verdi füravan nazü nemət,
Bədöv atları[3], həm zərbəft[4] xələt,
Otaqü, xeyməvü[5], xərgahü fərraş,
Bəsi leşgər onunla qıldı yoldaş.
Yamana uğramaz hər kim ola yaxşı,
Yamana deməzlər heç yerdə yaxşı.
Mənə qıl sən tərəhhüm, ey xudavənd!
Olasan bəhrəvər[6] manəndi Behgərd.
Xudavənda, Fədayi binəvadır,
Həmişə işi təqsirü xətadır.
Vəlakin səndən istər istiqasə[7],
Yamandan saxla qıl lütf, iqasə[8].
Bu nəql olunca oldu vaxt axşam,
Pəs ol Azadbəxt külli fərcam[9],
Apardılar buyurdu Bəxtiyari,
Müqəyyəd, binəva, yox ixtiyari.

[1] Hər cür hörmət
[2] Şirni
[3] Cıdır atı
[4] Zər baftalı
[5] Çadır
[6] Əməyin bəhrəsini ələ gətirmək
[7] Kömək
[8] Yardım etmək
[9] Qayə, aqibət

## SƏKKİZİNCİ VƏZİRİN PADŞAHIN YANINA GƏLMƏSİ

Gecə keçdi, yenə çün oldu sabah,
İlahi olmuya bədxah islah.
Yığılıban hamı gəldi vəzirlər,
Yenə şaha şikayət eylədilər,
Ki: şaha, nəngü, namin getdi badə,
Gərəkməz bundan həm səbr ziyadə.
Necə saxlayasan bu nabikari?[1]
Unutmuşsan məgər namusü ari?
Əgər vardır sənin şəkkü gümani,
Deyəlim necə gəlmişkən zəmani.
Qamumuz görməmiş həngamü fürsət,
Hərəmdən söyləşirkən neçə növbət[2].
Demədik qorxudan, qıldıq təqafül,
Görüb qıldın, özün təsdiq hasil.
Həqiqət sənə zahir oldu əhval,
Nədir qılmaq dəxi təsdiq ehmal.
Neçin onu yetirməzsən cəzayə?
Ki, ibrət ola hər bir nasəzayə.
Səninlə həmnişinü[3], həmzəbandır[4],
Nə deyim, vəqtşünasü[5], qissəxandır[6].
Gərək ola igidlərdə həmiyyət,
Bu sözlərdən şaha əl verdi qeyrət.
Qaraldı bərmisali qiri-qətran[7],
– Gətirin Bəxtiyari! – dedi Sultan.
Necə eyləyəlim səbrü təhəmmül?
Gətirdilər, buyurdu bitəhəmmül[8]:

---

[1] Yaramazı
[2] Dəfələrlə
[3] Bir məclisdə oturan
[4] Dilbir, həmsöhbət
[5] Vaxtdan istifadə edən
[6] Çoxlu hekayə bilən
[7] Qətran qırı kimi
[8] Vaxtı itirmədən

– Bu şumi-bihəyani parə-parə,
Qılın, ta xəlq edə ona nəzarə.
Əlində tiqi-Misri gəldi cəllad,
Dedi pəs Bəxtiyar: – Ey Bəxtazad!

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Həmişə dövlətin payəndə olsun,
Sənə xaqani aləm bəndə olsun!
Həqqə bir bax, eşitmə, qövli qəmmaz[1],
Məni çün şah qılmışdı sərəfraz.
Məni məmur edərdi, şah hər işə
Mənə möhtac idi onlar həmişə.
Bu gün düşdü olarə çünki fürsət,
Vurar onlar həsəddən mənə töhmət,
Olar sözü mənim həqqimdə böhtan,
Gərəkdir kim qəbul etməyə sultan!
Ölümdən qorxmaram, sən bil gəl agah!
Vəlakin qorxmazam mən ondan ey şah!
Ölümdən gər deyil mümkün xilasim,
Mənim səndən ala yəzdan qisasim.
Necə ki, mən eşitmişəm İlanşah,
Vəzirlər sözünə çün oldu gümrah[2],
Hər ondan axir aldı intiqami,
Yetirdi qətlə nahəq Butəmami.
– Kim idi? – dedi sultan – o İlanşah!
Bizə söylə olalım ondan agah!

[1] Böhtançı söz
[2] İnanıb yoldan çıxmaq

## PADŞAHIN HEKAYƏSİ
## VƏ BUTƏMAMIN SƏRGÜZƏŞTİ

Dedi pəs Bəxtiyar: ey dadküstər[1],
Pənah olsun sənə danayi-davər[2].
Rəfiq olsun sənə tofiqi-yəzdan,
Sənin rəyincə dönsün çərxi-dövran.
Həvadisdən[3] sənə asibü azar
Yetişməsin əya[4] şahi-cahandar.
Eşitdim var imiş bir mərdi-dana,
Süxandanü[5], süxənfəhmü[6], tavana[7].
Atası qoymuş ona Butəmam ad.
Həmişə şadü xürrəm, qəmdən azad,
Var idi çox onun əsbabü mali,
Ziyadə etməz idi qiylü qali.
Vəli bir zalimü birəhm sultan,
Qamu ölkəni o, etmişdi talan.
Olub əndişənak[8] ol mərdi-dərviş,
Çəkərdi fikir edib ənduhü təşviş.
Məbada kim onunla ol sitəmkar,
İrişib yetirə nöqsanü azar.
Dedilər var ona bir şahi-adil,
Kərimültəb[9] danüşməndü aqil.
Rəiyyətpərvərü miskin nəvazi,
Xudavü xəlq ondan cümlə razi.
Süpahü məmləkət halindən agah,
Cavanü xeyrixah, adi İlanşah.
Yetişdi bu xəbər, çün Butəmamə,
Mübahat[10] eylədi işbu kəlamə.

---
[1] Ədalətli
[2] Hər şeyi bilən Allah
[3] Hadisələrdən
[4] Ey
[5] Söz bilən
[6] Söz anlayan
[7] Varlı
[8] Qorxulu fikrə düşmək
[9] Kəramətli
[10] Qəbul etmək

Götürdü hər nə var, əsbabü malin,
Belə alıb gedər əhlü əyalin.
Rəvanə oldu, getdi varə-varə,
Yetişdi əz qəza çün ol diyarə.
Münasib töhfələrdən bari-xanə,
Tutub gətirdi ol şahi-cahanə.
Səlam eylədilər sultanə onlar,
Oxudular sənavü mərhəbalar.
Ona yer göstərib pəs qıldı təklif,
Dedi sultan: göz üstə gəldi təşrif,
Çü sultan məclisinə oldu daxil,
Onun göftarinə[1] şah oldu mail.
Fəsihü qabilü mətbuü məqbul,
Hünərməndü süxənara və məqul.
Mülaqat eylədi onunla sultan,
Ki, xoşnud oldu ondan, etdi ehsan,
Zərü simü yükəş əmvali-dünya[2],
Nə kim könlü dilər olmuş məhəyya
Dedi sultan: mənə gəl həmnişin ol!
Gecə-gündüz bizimlə həmqərin ol!
Gərəkdir bizə bir mərdü güzidə[3],
Xüsusən bir sənin tək kardidə[4].
Bizimçün həqq səni ey mərdi-kamil,
Yetirdi, müddəamiz oldu hasil.
Dedi pəs Butəmam: – Ey mərdi-ziba!
Qəbuli-mənsəb etməz mərdi-dana.
Kim ola həmdəmi mərdi səlatin,
Bəqa eyləməz[5] ona cani şirin.
Məlik hökmünə yox tədbirü çarə,
Kəminə bir qulam mən şəhriyarə.
Əlinə verdi sultan ixtiyarın,
Qamu işlərdə gördü etibarın.

[1] Söhbətinə
[2] Dünya malı
[3] Seçilmiş
[4] İş bilən
[5] Canını əsirgəməz

Özünə gördü şah onu müqərrəb,
Ona mənsub etdi nəsbü mənsəb.
Rücu eylərdi hər işi ona şah,
Yetirdi yerinə bərhəsbi-dilxah[1].
Var idi padşahın üç vəziri,
Müəyyən, hər birinin yox nəziri.
İmansız bir neçə əyyarü məkkar[2].
İraq həqdən, sitəmgər, mərdümazar.
Sərəfraz eylədi şah Buiəmami,
Həsəddən onların təlx[3] oldu kami,
Dedilər bir-birə: iş oldu müşkül,
Gərəkməz dəxi təqsirü təqafül.
Aradan götürəlim Butəmami,
Və ya tərk eyləyim mən bu məqami.
Biri dedi: budur tədbirə çarə,
Ki, avarə ola bu ol diyarə.
Eşitdim şahi-Rumin bir qızı var,
Kim onu görsə olmaz mərdi-hüşyar.
Onun avazəsi tutmuş cahani,
Üzü gül, filməsəl, püstə dəhani.
Hər iqlimdə müəzzəm bir padşah var,
Ona candan olurlardı tələbkar.
Ona hər kimsə kim elçi gedərdi,
Atası elçiyə gör kim, nedərdi?
Çü elçi olduğun eylərdi məlum,
Onun başın kəsibən qeysəri[4]-Rum.
Əgər şah elçi etsə Butəmami,
Aparsa qeysərə ol bu peyami,
Onu qətl eyləyər qeysər gümansız,
Bula yüz möhnətü qəmdən amansız.
Vəzirlər gəldi şahın həzrətinə,
Müşərrəf oldular çün xidmətinə,
Dedilər hər cəhətdən nəğlü əxbar,

[1] Ürəyi istədiyi kimi
[2] Hiyləgər
[3] Acı
[4] Padşah

Hədisi-xəttü-xalü hüsnü göftar.
Arayə saldılar onlar bəəmda[1],
Əsər eylədi sultana bu sevda.
Dedi sultana bir sahib cəmali,
Yox onun mislü manəndü misali.
Dedilər: şah onun bir qızı var,
Tutulur gün əgər göstərsə rüxsar.
Boyu tuba, gözü nərkəs, üzü gül,
Qaşı yay, kirpiyi ox, saçı sünbül,
Dişi dürr, ləbləri ləli-Bədəxşan,
Mələk görsə qalır əlbəttə heyran.
Nigari-nazənin, bir işvə əngiz,
Nihani qəmzəsi, cəlladi-xunriz.
Əsirü mübtəla qılmış cahani,
Alır can kim, ona baxsa nihani.
Dahan püstə, sözü bənzər nabatə,
Salıbdır fitnə, qövqa kainatə.
Dedilər ol qədər şirin fəsanə[2],
Ki, sultan aşiq oldu qayibanə.
Dedi sultan: gərək fərxəndə qasid,
Ona elçi qıla hasil müqasid[3],
İşarət eylədilər Butəmamə,
Onun adına çün yazıldı namə.
Çağırdı şah ol dəm Butəmami,
Dedi pəs ona: ey yari-girami!
Sən elçi ol bizə, qıl lütfü imdad!
Bizi sən eylədin xoşhalü dilşad.
Sənin tək bunda yoxdur bir süxəndan
Dedi: – Şaha, sənindir hökmü fərman
Tamam oldu büsati barixanə[4],
Pəs ol dəm Butəmam oldu rəvanə.
Gedərdi ruzü şəb mənzil-bəmənzil,
Yetişdi şəhrə çünki oldu daxil.

[1] Qəsdən
[2] Əfsanə, nağıl
[3] Məqsədə nail olmaq üçün
[4] Yol tədarükü

Müşərrəf oldu ali asitanə[1],
Gətirdi şahə, çəkdi barixanə.
Qəbul eylədi sultan dedi təhsin,
– Gəl əylən! – dedi, mənzil qıldı təyin.
Qılıb səcdə oturdu ol süxəndan,
Məlik qıldı ona əltafü ehsan.
Nəvaziş qıldı ona qeysəri-Rum,
Nə üçün gəldiyini qıldı məlum.
Dedi: xoş gəldin ey mərdi-süxəndam,
Gedib sən görgilən ol mahi-əndam[2].
Əgər var isə İlanşahə layiq,
Onun təbinə gər olsa müvafiq,
Əgər bilsəm qəbul eylər onu şah,
Rəvanə edəlim səninlə həmrah.
Bu gün var ixtiyarın, olma nadan!
Nə hasil sonradan olmaq pəşiman?
Buyurdu Butəmamə qeysəri-Rum:
– Dur indi sən həqiqət eylə məlum.
Rəvanə oldu ol dəm xürrəmü şad,
Ol evdə kim olurdu ol pərizad,
Mürəsse təxt, bir zərbəft pərdə,
Görür kim asılıbdır ara yerdə,
Oturmuş təxtdə rövşən avtabi[3],
Görüb pərdə, rəf olmuşdur hicabi.
Vəlakin Butəmam, ol mərdi-niku
Gözün açdı baxıb ol mahə doğru.
Nə baxdı soluna, ol dəm, nə sağə,
Gözün yumub başın saldı aşağə
Dedi qız ona kim: ey mərd, gər[4] sən,
Əcəb olmuya, kim həm lalü kərsən?[5]
Dedi o nazəninə: ey nikufal![6]
Kim olmaz padşahlar elçisi lal!

[1] Yüksək saraya
[2] Aya oxşayan
[3] Günəş kimi işıqlı
[4] Əgər
[5] Karsan
[6] Xoşbəxt

Mülaqat etmədi, ol nazəninə,
Qayıtdı yenə sultan məclisinə.
Dedi sultan ona: ey əhlü hümmət!
Necə gördün, bizə söylə həqiqət!
Dedi pəs Butəmam ol şəhriyarə:
– Göz açıb baxmadım mən ol nigarə.
Eşitmişəm ululardan nəsihət,
Mənə atam dəxi qılmış vəsiyyət.
Göz açıb baxma naməhrəm üzünə,
Qulaq asma dəxi böhtan sözünə.
Əlini, dilini sən saxla zinhar,
Yetirə kimsəyə nöqsanu azar.
Dilin döndərmə, sən hər bir yamanə,
Dil ucundan düşər hər kim ziyanə.
Əgər göz olmasa casusi-infaq,
Könül mərdlərə olmazdı muştaq.
Əlin, dilin, gözün, hər kimsə saxlar,
Yəqindir görməz ol asibu azar.
Eşitdi bu sözü çün ondan ol şah,
Dedi: təhsin, ona yüz barəkallah
Dedi pəs Butəmamə qeysəri-Rum,
Nihan sirrimi etdim sənə məlum.
Qız almağa bizə çox gəldi qasid,
Nə idi onlara ölmək məqasid.
Olara eylər idim, belə təklif,
Gəlib onlar mənə eylərdi tərif.
Edərlərdi çü tərifi-ziyadə,
Verərlərdi onunçün cani badə.
Könül mən qüssə ilə doldururdum
Bu sözü söyləyəni öldürürdüm.
Təəssüf artırardı mənə bu dərd.
Dedilər kim, görübdür, onu bir mərd,
Əgər göz açmayıb görməzdi anan[1],
Haçan torpaqla olurdu yeksan?
Səni gördüm çü mərdi badəyanət,
Gəlibsən xeyr işə, qıldın icabət,

[1] Onlar

Bu gün verdim mən İlanşahə iqrar,
Apar mətlubini, ey mərdi-dindar!
Əsasü xeyməvü xərgahü fərraş,
Cahan, cəmiyyət, qul, qarabaş[1].
Füravan simü-zər, ləlü cavahir,
Vəzirü xacə, fərraşü şatir[2].
Kecavə içrə girdi ol səmənbər,
Olarə qoşdu həm büsyar ləşgər.
Qamu ərkani-dövlətdən sərəfraz,
Müşərrəf eylədi xursəndi mümtaz.
Çalındı təblü kus şadyanə,
Fəraqül-bal[3], həm oldu rəvanə.
Bişarət şah İlanşahə gəldi
Özü qarşı çıxıb ol mahə gəldi.
Biləsincə tamam ol mir, ləşgər
Dedilər Butəmamə afərinlər!
Ona verdi ünanü[4] ixtiyari,
Ki, keçməz onsuz ol bir dəm qərari.
Çü oldu Butəmamin qədri əfzun
Bu mənidən[5] bular oldu cigərxun.
Dedilər: istədik tədbirü çarə,
Günümüz bundan ilə oldu qarə.
İki kimsə var idi şahə həmdəm[6]
Ki, şahdan ayrı olmaz ləhzə bir dəm
Olarə yalvarıb qıldılar, ilhah,
Dedilər: bizə axşam oldu səbah.
Bizimçün zaye oldu tirə ovqat,
Nə tədbir edəlim biz qalmışıq mat.
Əgər siz qılasız əltafü ehsan,
Bizim üçün olur bu müşkül asan.
Dedi onlar kim, ey ərkani-dövlət!
Buyursuz hər nə qulluq canə minnət.

---

[1] Qaravaş, qulluqçu qadın
[2] Şah qulluqçusu
[3] Sakitliklə
[4] Cilov (burada ixtiyar deməkdir)
[5] Cəhətdən
[6] Yaxın dost

Dedilər: siz həmişə şahə xidmət
Qılırsız, hər zaman kim olsa fürsət.
Gəlib sultan edəndə istirahət,
İkiyiz bir-birə edin hekayət:
Ki, hər kimin olursa əsli napak,
Canında qorxu olmaz, ola bibak[1].
Ki, tərk etmədi bu sevdayi-xami.
Gör o namərdü bikəs Butəmami.
Ona hər vaxt müyəssər ola fürsət,
Hərəmdə eylər imiş ol xəyanət.
Qamu bilir bu sözü aşikarə,
Deyən yoxdur bu sözü şəhriyarə.
Dedi: bilməz bunu infaqi-casus,
Fəraqət eylər ol rəzzaqi-salus[2].
O saət kim ol şahi-cahandar,
Əgər ki, yatmış ola yoxsa bidar,
Eşitsə sizdən ol bu göftü-guni[3]
Aradan götürər işbu əduni.
Vəzirlər etdilər belə nəsihət,
Pəs onlar dedilər kim canə minnət.
Pəs ondan sonra qullar bir-birilən
Danışuban məgər eşitdi sultan.
Qulağına yetişdi bu fəsanə,
Məlik düşmüş oda, döndü ilanə.
Acıqlandı ona əl verdi qeyrət,
Çağırıb dedi kim: ey bihəmiyyət,
Qələt etdim səni qıldım sərəfraz,
Yox imiş sən təki bədfelü, keçbaz[4]
Sən ey bietibarü bidəyanət!
Qılırsan bizim ilə sən xəyanət?
Dedi pəs Butəmam ol dəm bəsultan,
Ki, şaha, qıl ədalət, eylə ehsan.
Mənə sabit əgər olsa xəyanət,

---

[1] Qorxusuz
[2] Yalançı
[3] Danışıq
[4] Xəyanətkar

Sən eylə mənə ənvai[1] siyasət.
Həzər qıl, etmə nahəq əmrü fərman,
Ki, axır qorxuram olan peşiman.
Məni kəs qiymə-qiymə, parə-parə,
Ki, ibrət ola hər bietibarə.
Qəbul etmədi sultan bu kəlami,
Yetirdi qətlə nahəq Butəmami.
Çü nəşi oldu onun qərqeyi-xun[2],
Apardı qullar onu etdi mədfun[3].
Çü oldu Butəmam torpağə vasil,
Vəzirlər müddəası oldu hasil.
Olara oldu ol dəm toy və bayram,
Yaraları sağaldı, buldu aram.
Vəli qəmdən pərişan oldu sultan,
Özü öz felinə oldu peşiman.
Məgər bir gecə durdu qəhrü kindən,
Keçər qulların qəsri önündən.
Dedi bir-birinə ol iki bədgü:[4]
Oların gözünə gəlməzdi yuxu.
– Yaman eylədik ol miskinə böhtan,
Onu nahaq yerə öldürdü sultan.
Eşitdi dərzəman, çağırdı sultan:
– Mənə zahir edin bu sirri pünhan.
Dedilər qullar ona: kim şəhənşah!
Vəzirlər eylədi çün bizi gümrah.
Bizə eylədilər çox axca təslim,
Bu növ ilə bizi böhtana təlim.
Vəzirlər oldu bais bu fəsadə,
Sitəm, zülmü sərih, ol namuradə.
Qılıban şah onu, öldürdü nahəq
Deyildi sahibi-təqsir mütləq.
Gümani-bəddir, bilirmiz axiri-kar,
Onun qani bizi eylər giriftar.

[1] Hər cür
[2] Qana bulanmış
[3] Dəfn etmək; basdırmaq
[4] Böhtançı

Olardan bu sözü eşitdi çün şah,
Təhəmmül etdi, ta oldu səhərgah.
Sabah oldu vəzirləri gətirdi,
Üçün dəxi o dəm qətlə yetirdi.
Durub, evə gedib ol əhli-hümmət,
Yenə xatün ilə qıldı məhəbbət.
Nə üçün mənim ilə sərgiransən?[1]
Nədir təqsir bilməm, neylədim mən?
Nə əl verdi mənimçin ey səlamət!
Onunçün eylədi sultan, hekayət.
Təmamət hər nə var dedi sərasər,
Eşitdi bu sözü ol huri-peykər.
Dedi şahə: bu mənidən[2] ol agah,
Olubsan sən bu gün əlhəmdülillah,
Şaha həm zahir olmuşdur həqiqət,
Ki, məndə yox imiş nöqsanü sirət.
Bu sözdən oldu azürdə[3] həm ol zən
Könüldə oldu sultan ilə düşmən.
Ona müstoli[4] oldu xişm ilə qəhr,
Şahın aşına daxil eylədi zəhr.
Yedi aşı rəvan tapşırdı cani,
Çü öldürmüşdü nahəq Butəmami.
Qalıb ləşgər, qılıb fəryad, əfqan,
Gətirib qıldılar torpağə yeksan.
Pəs ol xatun, həmişə zarü məyus,
Deyərdə: ey driqa[5] nəngü namus.
Mənim töhmətli adım getdi badə,
Dirilik istəməm bundan ziyadə.
Pəşimanəm, bu dirilikdən, pəşiman,
Yanında var idi bir tiği-bürran[6].
Qınından çəkdi, özün saldı üstə,

[1] Acıqlı
[2] Məsələdən, hadisədən
[3] İncimiş
[4] Qalib gəldi
[5] Əfsus
[6] İti bıçaq

Bulandı qanda ol məcruhü xəstə.
Rəvan can eylədi canana təslim,
Xəbərdar oldu ol ərbabi-təzim.
Gətirib qıldılar barəsmi-qanun[5]
Əri qəbri yanında onu mədfun[6].
Fədai, çəkmə sən ənduhü qeyqu,
Muradə etməyə[7] bədxahü, bədgu.
Xəcildir, münfəildir[8], hər nə kim var,
Olur öz felinə axır giriftar.
Eşit sultan, kəminə Bəxtiyarəm,
Günahım yox, yəqin mən rəstkarəm
Mənə mümkün əgər yoxdur xilasi,
Sənə həqq çəkdirə axır qisasi.
Təmam etdi sözün ol nikfərcam,
Yenə gün batdı oldu vəxti-axşam.
Yenə apardılar nalanü giryan,
Müqəyyəd oldu əndər künci-zindan.

## DOQQUZUNCU VƏZİRİN PADŞAHIN YANINA GƏLMƏSİ

Yenə ruzi-nöhün[1] cümlə vəziran
Gəlibən qıldılar fəryadü əfqan:
– Əlindən padşahim, dadü bidad,
Bari sən eylə bu bədbəxti azad!
Yetirir bir vəsilə, bir bəhanə,
Səninçin söylər ol hər gün fəsanə.
O bir fitnə, düru[2], zərraqü[3], salus
Məgər yoxdur səninçün nəngü namus?
Məgər yoxdur səninçün əql ilə huş,

---

[1] Qayda-qanun ilə
[2] Dəfn
[3] Etməsin
[4] Kədərlidir
[5] Doqquzuncu gün
[6] İkiüzlü
[7] Hiyləgər

Təqafül birlə sultan oldu xamuş.
Vəzirlər hamısı durdu ayağə,
Yığıldılar hərəm ol gündə bağə.
Pəs ol dəm yazdılar xatunə ərzə,
Ki, qeyrət canımıza saldı lərzə[4].
Ki, bir bədbəxt, bir bədfel şeyda,
Səni qıldı əcəb bədnamü rüsva.
Onu öldürməyə sultan təqafül,
Qılır, san əqlini xoş etdi zayil.
Necə kim ölməyibdir, ol cavanmərg,
Sizə yaman deyər, xəlq eyləməz tərk.
Əgər dildən sala eylərsə xamuş,
Xəlayiq bu sözü eylər fəramuş.
Təqafül etmə gəl sən səyi-büsyar,
Şaha bir ləhzə qıl təkidü təkrar.
Deyəsən rəf olur dildən gümani,
Ki, şayəd öldürə bu nasəzani.
Deməkdən bu sözü xəlq ola xamuş,
Edələr bu sözü mütləq fəramuş.
Bu sözdən müttəle oldu çü xatun,
Müşəvvəş-xatır oldu, çün digərgun.
Divandan çun qayıtdı, gəldi sultan,
Yanına gəldi ol xatun giryan.
Dedi sultan: – Olubsan, neyşə dilgir?
Dedi xatun: ki, ey şahi-cahangir!
Dəxi yox məndə taqət, səbrü aram,
Cahanda olmuşam rüsvayü bədnam.
Bugün öldürməsin gər Bəxtiyari,
Aradan salmasın ol nabikari.
Yetirməsən diləyim, ehtiyacım,
Özümü öldürərəm, yox əlacım.
Təərrüzgunə sözlər dedi övrət,
Yenə sultanə qalib oldu qeyrət.
Acıqlandı, yenə buyurdu sultan
Gətirdilər onu iftanü xizan

---

[1] Titrətmə

Dedi sultan ona: ey duni-bədtər!
Ölüm oldu sənə axır müqərrər.
Həqiqətsiz, həyasız, bivəfa, şum,
Hərəmdən eylədim təhqiqü məlum.
Mənə ixbar qıldı çün şəhadət,
Ki, səndə varmış meyli xəyanət.

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi, pəs Bəxtiyar: ey şahi-adil!
Eşitməz qövli-zən[1] kim olsa aqil!
Həzər qıl, mən ölümdən çəkməzəm bak,
Vəli, övrətdə olmaz əqlü idrak!
Həmişə övrət eylər məkrü hiylə,
Olur hər fitnə övrətdən vəsilə.
Necə övrət ki, etdi məkr həm fənd,
Öz oğlun verdi qətlə ey xudavənd!
Deyər daim, səlamət ola cani,
Dəxi fərq eyləməz yaxşı-yamani.
Özü öz oğluna çün etdi böhtan,
Haçan övrətdə olur əqlü iman?
Kim idi? – Söylədi sultan. – O, övrət?
Özü öz oğluna eylədi töhmət?

## BƏXTİYARIN PADŞAH SƏRGÜZƏŞTİNİ NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar: ey xani-xaqan!
Əlində daim olsun hökmü fərman!
Var idi bir müəzzəm padşahi,
Bəşəhri-Misr onun həm təxtigahi.
Fəraqət müttəssil, xoşnudü eymən,

[1] Qadın sözü

Yox idi heç tərəfdən ona düşmən.
Qayırmazdı qoşun ol mərdi-bibak[1],
Məvacib verməyib, eylərdi imsak[2].
Nə bir qanun, nə bir dəftər, nə divan.
Rəiyyət müztərib, ləşgər pərişan.
Var idi padşahın bir vəziri,
Hünərmərdü süxəndan, mərdi-piri!
Qəbul eylər nə kim söylərdi ol pir,
Bu halə eylədi ol pir təqdir.
Gərəkdir var ola sultanə fərzənd,
Ki, şayəd ol ola bundan xirədmənd.
Hərəmdə var idi bir neçə övrət.
Cəmilə, sahibi-namusü ismət.
Üzü gülbərg tək şəkkər dodağı,
Vəlakin onların olmaz uşağı.
Gəlib şah yanına ol mərdi-hüşyar[3],
Dedi: sultani-Rumun bir qızı var.
Cəmali dilfəribü hüsni ziba,
Dodağı filməsəl[4], gülbərgi-rəna,
Səhi qəddü səmənbuyü səmənbər,
Pəritələt, bəeyni[5] huri-peykər.
Əgər görsə cəmalin hurü, qılman,
Olur pərvanə tək sərgəştə, heyran,
Mübarək tələtü fərxəndə[6] əxtər,
Cəmali-pərtövündən[7] xanə ənvər.
Ziyadə eylədi osafü[8] tərif,
Pəs ondan eylədi sultanə təklif:
Gərək sultan ala ol hurizadi[9],
Həqqə bağlaya sidqi, etiqadi,

[1] Qorxusuz kişi
[2] Qənaət
[3] Ayıq kişi
[4] Misal üçün
[5] Lap
[6] Xoşbəxt
[7] İşıqlı üzündən
[8] Vəsf-tərif
[9] Mələk balasını

Məgər hasil ola ondan bir oğlan,
Ki, səndən son ola ümmidi xəlqan.
Bu söz oldu qəbuli-təbi-sultan,
Müşərrəf xatır oldu, şadu xəndan.
Vəzir aldı ələ çün tərhi-xamə,
Rəvan sultani-Rumə yazdı namə.
Tamam oldu mətaü barixanə
Götürüb elçi pəs oldu rəvanə.
Yetişdi, eylədi çün ol diyarə,
Çəkildi pişkəşlər şəhriyarə.
Qılıb hörmət, təvazö[1], qeysəri-Rum,
Gəlibdir nə üçün eylədi məlum.
Məhəbbət etdi çox ol həddən əfzun,
Cavabi-namə yazdı işbu məzmun:
– Bizə tərsa deyərlər, siz müsəlman,
Dönüb dindən əgər ola pəşiman,
Yaxub məshəf[2], belə bağlaya zünnar[3],
Sən ol tərsa, əgər gəlməz sənə ar.
Qəbul gər eyləsən, bu dinü millət,
Verərəm qızımı mən, canə minnət.
Bu sözü gər qəbul etməz bəradər,
Yəqin bil kim, bu iş olmaz müyəssər.
Qayıtdı elçilər məhzunü qəmgin,
Gətirdilər şahə namə cavabın.
Buyurdu açdılar gəncü xəzinə,
Neçə illik məvacib hər birinə.
Bölüşdürdü qayırdı ləşgərin şah,
Qamu sərhədd, vilayət, oldu agah.
Yığıldı hər tərəfdən xəlq büsyar,
Rəvanə oldu pəs sultanü sərdar.
Yavuq çün yetdilər ol mərzü bumə[4],
Xəbər gəldi rəvan sultani-Rumə.
Döyüldü təbl ba kusü nəğarə,

[1] Kafər
[2] Quran
[3] Kafərlərə məxsus qurşaq
[4] Ölkənin mərzi, sərhədi

Yığıldı cəm tərsa bişümarə[1],
Bərabər durdu tərsavü müsəlman.
Göyə yetdi xruşü ahü əfqan.
Çü oldu üzbəüz, kaplan ilə şir,
Hamu əldə sinanü[2] nizə, şəmşir.
Qubari-tirədən[3] xurşidi-taban,
Sanasan əbr[4] içində oldu pünhan,
Qarışdı bir-birə ləşgər təmamən.
Sanasan qopdu qovğayi-qiyamət,
Bulara pəs açıldı çeşmeyi-xun,
Qızıl qan ilə meydan oldu gülgun.
Müsəlman güclü, tərsa oldu məğlub,
Basıldı ol zaman məcruhi-məğlub.
Şəhi-Rum oldu çün məcruhü xəstə,
Gətirdilər müqəyyəd dəst-bəstə.
Şəhadət gətirib oldu müsəlman,
Nəsib odu ona islamü iman.
Qızın iqrarını çün aldı ol şah,
Deyildi o qızın halından agah.
Vəli qızdan eşit sən bir hekayət,
Bu məzmun eyləmiş ravi rəvayət:
Ki, bundan irəli bir neçə illər,
Qamu ərkani-dövlət həm bilirlər.
Məgər sultanə qovm[5] idi bir oğlan,
Ona vermiş idi qızını sultan.
Rza verdi, nigah eylədi qazi,
Pəşiman oldu çün, olmadi razi.
Çü münkər oldu[6], gətirdi bəhanə,
Cavab eylədi pəs ol novcəvanə.
Dəmaqi xüşk olub, oğlan mükəddər,
Məgər bir gün vüsal oldu müyəssər.

---

[1] Saysız
[2] Yaraq
[3] Qaranlıq tozundan
[4] Bulut
[5] Qohum
[6] Sözündən döndü

Bir ara gəldi iki yari-cani,
Sanasan gördü bülbül gülüstani.
Bir ara gəldi ol qız, həm oğlan,
Olardan zayil oldu əqlü iman.
Qızın getdi əlindən ixtiyari,
Kəsildi oğlanın səbrü qərari.
Arada yox rəqibü səg təbiət[1],
Müyəssər vəsli canan, cayi xəlvət.
Cana şəhvət odu saldı hərarət,
Götürdü qızdan ol mehri-bəkarət,
Uşağa qaldı ol dəm düxtəri-şah,
Bu halə olmadı heç kimsə agah,
Çü oldu hamilə, düşdü gümanə,
Yetişdi dayə ol sirri-nihanə,
Dedi pəs dayəyə ol sərgüzəştin,
Dedi pəs dayə ona: olma qəmgin!
Pərişan olma, məhzun, ağzı acı,
Mən ona eylərəm yaxşı əlacı.
Bilirdi necə qıla ona dərman,
Onun uşağına olmadı nöqsan.
Həmişə dayə idi həmnişini,
Rəayət eyləyən ol nazənini.
Çü onda hamilə olmuşdu dayə,
Təsəlli verdi o məhlliqayə.
Bu sirrə olmadı kimsə xəbərdar,
Qəzara çün yetişdi vədeyi-kar,
Vücudə gəldi ol qızdan bir oğlan,
Nə oğlan, bəlkə bir xurşidi-taban,
Pəs ol oğlanı dayə etdi pünhan,
Görün ol dərdə necə etdi dərman?
Özü həm doğdu bir qız aşikarə,
Dedi budur mənə tədbirü çarə!
Qızı öldürdü dərdəm, etdi pünhan,
Qız əvəzinə qaldı ona oğlan,
Qızın yerinə oğlanı təsərrüf,
Qılıban, çəkmədi ahü təəssüf.

[1] İt xasiyyətli düşmən

Bu fikr ilə bu fitnə oldu pamal.
Necədir duymadı kimsə bu əhval,
Onu bəslədi, yetirdi kəmalə,
Boyu bənzərdi bir növrəs nəhalə[1]
Qaşı yay, kirpiyi ox, gözü cəllad,
Görən kimsə üzün, qəmdən olur şad.
Dişi dürr, ləbləri ləli-Bədəxşan,
Dili bülbül, sözü yağutü mərcan.
Vəcihə[2] qabil, mətbuü[3] məqbul,
Zərifü pak, danişməndü məqul,
Çü ali xəlq içində oldu məşhur,
Deyərlər Dayə oğlu ona məşhur.
Çü şahi-Rum Misrə verdi qızi,
Onunla getdi dayə, həm kənizi.
Dedi: ey mehriban, cansuz[4] dayə!
Əlac eylə bu dərdi-bidəvayə.
Yenə məkr eyləyübən qıldı dərman,
Ki, bikr olmadığın bilmədi sultan.
Təsərrüf eylədi ol gülüzari,
Yox idi onsuzun bir dəm qərari.
Əgər çi onu çox istərdi sultan,
Vəli getməzdi yanından oğlan.
Məgər bir gün hərəmdə dedi sultan,
Gərəkdir bizə bir pakizə oğlan.
Vəcihü zirəkü sahib fərasət
Ola həm süfrəçi, həm pişxidmət[5].
Dedi xatun babamın bir qulu var,
Vəcihü qabilü movzunu[6], həmvar.
Dediyi, etdiyi təbə müvafiq,
Bu işdən yoxdur ona qeyri layiq.
Yaraşır qılasan hər əmrə məmur,
Deyərlər Dayə oğlu, ona məşhur.

---
[1] Cavan ağac
[2] Gözəl
[3] Xoşa gələn
[4] Can yandıran, qayğıkeş
[5] Qulluqçu
[6] Hər cəhətdən düzgün

Bu təqrib eylər ol sərxeyli-xuban[4],
Dedi bu sözü, çün eşitdi sultan,
Yazıb namə, ona göndərdi qasid,
Çü məlum oldu mətlubü məqasid,
Gətirib qasid ol sultan-pəsəndi,
Görüb sultan onu candan bəyəndi.
Buyurdu xidmət ol darül-imarə,
Yetirdi yerinə həsbül-işarə[5].
Ona şəh eylədi ezazü hörmət,
Həm oldu süfrəçi, həm pişxidmət,
Qılırdı xidmət ol bir vəch, kim şah,
Deyərdi hərdəm ona: barakallah!
Vəlakin heç olmazdı müyəssər,
Onu birdən görə ol hüri-peykər,
Məgər bir gün, qəzara oldu xəlvət,
Onu görməyə xatun buldu fürsət.
Görüb xəlvətdə onu, yandı canı,
Bədəndə şövqilə qaynadı qanı.
Çü məhzuz[1] oldu oğlanın sözündən,
Qucub boynun, onun öpdü üzündən,
Vəli döndərdi üzün, qaçdı oğlan,
Əlindən qurtulub oldu girizan.
Vəli bir xacə gördü onu nagah,
Pəşiman oldu xatun, eylədi ah!
Dedi: – Görün nə iş gəldi başıma.,
Necə mən ağu qatdı öz aşıma!
Bu sözü gər desə sultanə izhar,
Qılım asan işim olmuya düşvar[2],
Gəlib sultanə etdi dadü bidad,
Bu gün gör bu qulami-şuxü şəyyad[3]
Uzatdı əl mənə bədəhlü küstax,
Onu sən eylə gər, surax-surax[4],

---

[1] Saray qulluqçusu
[2] Bir işarə ilə
[3] Xoşlandı, həzz aldı
[4] Çətin
[5] Sevgili
[6] Deşik-deşik

Buyurdu şah ol dəm gəldi oğlan,
Vücudi qeyrətindən oldu lərzan.
Şəha! Yoxdur mənim mütləq günahim,
Bu mənidən mənim vardır güvahim[1].
Dedi: kimdir güvahin? Dedi: Xacə!
Dedi: həm Xacəyə, görmüşdü necə;
Ki, şaha bigünahdır işbu oğlan,
Rəva görmə ona azarü nöqsan.
Ol övrət, eylədi oğlanə təklif,
Pəs oğlan verdi ol təsdiqə təhqiq.
Əlindən qurtulub oldu girizan,
Bu sözü Xacədən eşitdi sultan.
Acıqlandı, qəzəbləndi bu sözdən,
Pəs ol xatuni sultan saldı gözdən.
Xəyalü fikr edib düşdü gümanə,
Gümandan rəngi döndü zəfəranə.
Ata evində ikən bu qız, oğlan,
Var imiş ikisi bir-birə xahan,
Məgər oğlan alıb gəlmiş gülabi
Götürmüş ola ol qızdan hicabi.
Tutuldu çünki dustaq oldu oğlan,
Müqərrər oldu ona bəndü zindan.
Çü məşhur oldu xəlqə bu hekayət,
Yenə xatun şahə qıldı işarət:
Məni işbu qulami-bədsərəncam[2],
Cahanda eylədi rüsvayü bədnam.
Bunu öldür ki, nöqsan oldu sirət.
Əgər vardır sənin canında qeyrət,
Əgər sən eyləsən bu işdə təqsir,
Özümü öldürərəm, yox özgə tədbir.
Mənim namusumu ol verdi badə,
Diri qoyma onu bundan ziyadə.
Dedi övrət çü şahə bu kəlami;
Cağırdı şah pəs ol dəm qulami
Dedi: ey qul, apar əndər nihani,

[1] Şahid
[2] Xain fikirli

Kəsib başın sən öldür bu cavani.
Dedi: heyf ola, bu xurşidi-taban,
Ola nahaq yerə torpağa yeksan.
Necə mən öldürüm bu bigünahi?
Bunun əlbəttə yerdə qalmaz ahi.
Münasib yerdə onu qıldı pünhan,
Rəayət eylər idi əzdilü can.
Vəli könlündə qaldi şahə kinə,
Deyildi mültəfit ol nazəninə.
Bu idi müttəsil fikrü xəyaldan,
Nola olaydı bir sahib kəmaldan;
Xəbərdar ola ol yaxşı yamandan,
Çıxaraydı məni şəkkü gümandan.
Özündən bir xəbər olsaydı təhqiq,
Bileydim bigüman, bər həsbü təsdiq
Kim ol övrət dürər, sahib xəyanət,
Qılaydım ona iyzavü[1] əhanət[2].
– Nöşün qəmnaksən ey şahi-xuban?[3]
Məgər kim səndə yoxdur meyli sultan?
Dedi xatun: olum mən necə xürrəm,
Məni gözdən salıbdır şahi-aləm.
Özümdə bilməzəm heç gunə təqsir,
Nədir bilməm bu dərdə çarə tədbir.
Dedi dayə: elə sən dərdin izhar,
Ona mən eylərəm dərmanü timar[4].
Dedi xatun ki, ey dayə eşit sən!
Deyə bilməm bu dərdi kimsəyə mən.
Bilirəm mən bu dərdə yoxdur dərman,
Gərək eşitməyə[5] bu rəmzi sultan.
Dedi pəs dayə: ey huri-pərivar[6],
Olur hər dərdə bir dərmanü timar.

---

[1] Əziyyət vermək, cəzalandırmaq
[2] Etibardan salmaq
[3] Gözəllər padşahı
[4] Yardıma ehtiyacı olan adama kömək etmək
[5] Eşitməsin
[6] Mələyə oxşayan

Nə dərdin var isə danayə[1] söylə,
Demə nadanə; ondan ibrət eylə.
– Gəl ey xatun, eşit məndən bu gün pənd;
Səninçin eyləyim mən yad söykənd[2]
Deməyim kimsəyə bu sirri-razi,
İşinə olayım mən karsazi[3].
Əlinə məshəf aldı, içdi sokənd,
Təsəlli tapdı ol xatuni-dilbənd.
Dedi pəs dayəyə ol huripeykər,
Yaman-yaxşı, tamam halin sərasər.
Dedi dayə ki: səndə yoxdur təqsir,
Deyil xali işin əzhökmü təqdir.
Atan vermiş səni bir növcəvanə,
Müvafiq şərü, qanuni-zəmanə.
Sənin həm var imiş bir zövci-mazi[4],
Səninçin eyləmiş həm əqd qazi.
Çü ondan hasil olmuşdur bu oğlan,
Məgər bilməzmidir bu hali sultan?
Əgər o bilə bu razü-nihani,
Sənə təlim edib məkri-zənani.
Gecə sən özünü salgəl yuxuyə,
Dilin cari ola bu göftüguyə.
Demişlər doğrudur, doğru əyilməz,
Əgər doğru ilə əyri, doğru gəlməz.
Degəl sən sərgüzəşti-hali-qissə[5]
Tamam ola yəqin ənduhü qüssə.
Çü verdi xatunə ol dəm bu pəndi
Bu pəndi dayədən xatun bəyəndi.
Durub sultan yanına gəldi dayə,
Götürüb əl, şüru etdi duayə.
Ki, ey şahi-cahan, sultani-aləm!
Həmişə olasan sən şadü xürrəm!

---

[1] Ağıllı adam
[2] And içmək
[3] Yardım göstərmək
[4] Keçmiş ər
[5] Başına gəlmiş hadisəni

Eşitmişəm ki, ey şahi-cahan sən,
Bəqayət xatun ilə dilgiransan.
Dedi: ey dayə, ondan sərgiranam[1],
Onunçün ki, mən ondan bədgümanəm.
Cahanda verdi badə nəngü nami,
Onun ucundan öldürdüm qulami.
Yəqin bilməm, vəli düşdüm gümanə,
Ki, böylə imiş o keçmiş zəmanə.
Qılıram ol qədər səbrü təhəmmül,
Bu işə ta yəqinim ola hasil.
Nə saət kim, yəqin etdim gümani,
Vurub ona bu tiği cansitani[2]
Dedi: dayə, kim ey şahi-cahangir!
Onun çün qılmışam bir fikrü tədbir.
Qulaq as, bu sözü məndən eşit sən,
Gecə yuxuda ola çünki ol zən,
Qoy onun köksünə bir pəri-hüdhüd[3],
Düşində[4] sirri razin deyə labüd.
Deyər bişəkk tamam ol sərgüzəştin,
Həqiqət sənə zahir ola yəqin.
Çıxasan ol zaman şəkkü gümandan,
Xəbərdar olasan yaxşı-yamandan.
Gecə yatmış ikən o mahi-rüxsar,
Gözü yuxuda, əmma könlü bidar.
Gəlib sultan könüldə buğzu[5] kinə,
Qoyub ol pəri onun sinəsinə,
Qulaq asdı onun köftarinə şah,
Eşitdi yuxuda söylərdi ol mah,
Nə kim keçmiş başından sirri pünhan,
Dedi bir-bir onu eşitdi sultan.
"Çü verdim qətlə mən fərzəndi dilbənd,
Ki, məndən bədgüman olma xudavənd!

---
[1] Nigaran
[2] Can alan bıçaq
[3] Şanabubbu tükü
[4] Yuxusunda
[5] Ədavət, kin

Onunçün ölümə verdim mən oğlan,
Ki, məndən bədgüman olmaya sultan.
Oğul getdi əlimdən, qalmışam zar,
Əcayib möhnətə oldum giriftar,
Əgər getdi oğul, çəkməm nədamət,
Həmişə sağ ola sultan səlamət!”.
Çağırıb ol yuxudan qıldı agah,
Eşitdi sərgüzəştin çün onun şah.
Çü xabi-məsləhətdən oldu bidar,
Dedi sultan ona kim: ey vəfadar!
Eşitdim hər nə dedin, şərhi-təqdir,
Yox imiş səndə mütləq cürmü təqsir.
Əgər bu sirri sən qılsaydın izhar,
Oğul getməzdi, həm çəkməzdin azar.
Nədamət çəkdi, sultan oldu giryan,
Onu öldürməyə oldu pəşiman,
Eşitdi bu sözü ərkani-dövlət.
Məlik onlar üçün qıldı hekayət,
– Driqa, kim əlimdən getdi fürsət!
Deyib hərdəm çəkərdi ahü həsrət
Qamu əşrafü əyan oldu qəmnak,
Baş açıb qıldılar çün yacalar çak[1].
Eşitdi ol cavan çün bu fəqani,
Kim ol oğlani saxlardı nihani.
Evə gəldi rəvan ol paki-tələt
Ona başdan-ayağa verdi xələt.
Gətirdi oğlani sultanə dərhal,
Onu sultan görübən oldu xoşhal.
Çü oğlan qayib ikən oldu zahir,
Başına səpdilər ləlü cəvahir.
Nişatu eyş ilə toy oldu bayram.
Fəraqət oldu onlar tutudu aram.
Göz açıb gördü madər[2] çünki oğlan,
Sicud[3] eylədi, qıldı şükri-yəzdan.

[1] Yaxa yırtmaq, ağlamaq
[2] Ana
[3] Səcdə

Üzündən öpdü ol dəm xürrəmü şad,
Qamusu bəndi qəmdən oldu azad.
Qılıb ənamü ehsan ol şəhanşah,
Onu taxta çıxarıb eylədi şah.
Ol oldu padşahi-dadgüstər,
Cahan oldu onun hökmünə yeksər.
Ona həqq verdi dövlət, şənü şövkət
Müsəxxər[1] oldu ona əsri dövlət.
Fədayi, olasan ondan xəbərdar.
Eşitmə qövli-zən zinhar, zinhar.
Yəqin bil övrət eylər məkrü təlbis[2],
Onu bilməyə, aciz qala İblis.
Ümidim var xudavəndi-cahanə,
Bizi uğratmaya məkri-zənanə,
Bu nəğli Bəxtiyar edincə axir,
Sitarə göy üzündə oldu zahir.
Günəş məğrib zəmində oldu pünhan,
Müəzzin[3] söylədi təkbirü əzan.
Yenə zindançıya sultan buyurdu,
Aparıb yenə onu bəndə vurdu.

## ONUNCU VƏZİRİN PADŞAHIN YANINA GƏLMƏSİ

Cecə oldu, yenə gəlib səhərgah,
Gəlib şah yanına ol qövmü bədxah.
Yenə eylədilər fəryadü əfqan,
Ki, biz də olmuşuq qəmdən pərişan.
Məgər belə olur ərlik, həmiyyət,
Hanı namusü namü nəngü qeyrət.
Utandıq, şərməsar olduq, deməkdən,
Baş alıb gedəlim bu məmləkətdən.
Hərə bir söz deyib ol qövmü napak,

[1] Hökmü altına keçdi
[2] Hiylə
[3] Əzançı

Ki, sultan xişmigin oldu qəzəbnak.
Gətirsinlər dedi ol binəvani,
Ki, qətl eyləyəyim ol bihəyani.
Gedib ol dəm rəvan qullar şitaban,
Gətirdilər onu iftanü xizan.
Dedi: ey Bəxtiyarü-şumü bədzat,
Səninlə eylədim bəsdir mülaqat.
Təqafül eylədim bir neçə gün mən,
Müqərrərdir bu gün ölmək gərək sən.

## BƏXTİYARIN PADŞAHA CAVAB VERMƏSİ

Dedi pəs Bəxtiyar: ey şahi-pürgin![1]
Fəda olsun yolunda cani-şirin.
Ölümüm gər sənin əlində Allah
Müqərrər eyləmiş, əlhökmü-lillah!
Əgər yoxdur mənə tədbirü çarə,
Nola qurban olam mən şəhriyarə,
Əgər belə deyil, təqdiri-Allah,
Məni öldürə bilməzsən bu gün şah!
Necə kim öldürə bilmədi oğlun,
Şahənşahi-diyari-ölkeyi-Çin.
Dedi: sultan şahi-ölkeyi-Çin
Nə üçün öldürə bilmədi oğlun?

## BƏXTİYARIN PADŞAH SƏRGÜZƏŞTİNİ NAĞIL ETMƏSİ

Dedi pəs Bəxtiyar, ey şahi-xuban!
Pənahında səni saxlaya yəzdan!
Var idi bir müəzzəm padşahi,
Diyari-Çinü Maçin[2] qibləgahi

---

[1] Kinli
[2] Monqolustan

Diyari-Çini ol almış nəginə[1].
Çox onda cəmiyyət, gənc, xəzinə.
Əsasi-səltənət, əsbabi-dünya,
Nə kim könlün dilər, olmuş mühəyya.
Müyəssər ola ona tacü əfsər,
Vilayət, ləşgərü divanü dəftər.
Cavanmərdü kərimül-təb[2] adil,
Nə kim, könlü dilər olmuşdu hasil.
Şücavü, kamilü vala, xirədmənd
Vəlakin yox idi sultanə fərzənd.
Bina eylədi məscid, körpü bünyad,
Qulamü həm kəniz eylədi azad.
Nə yerdə var idi üryanü[3] həm ac,
Yetimü müstəhəqq, yoxsul və möhtac.
Doyurdu onları, həm etdi xeyrat,
Qılırdı əhli-həqq ilə mülaqat.
Firavan axça[4] verdi əhli-həqqə,
Bölüşdürdü, yetirdi müstəhəqqə.
Onun dövründə var hər kim rəiyyət,
Məaf etmişdi[5], olmuşlar fəraqət.
Ola oğlu, ola hasil muradi,
Həqqə bağlamışdı o, etiqadi.
Qəbul oldu həqqə xeyratü ehsan,
İnayət qıldı ona həqq bir oğlan.
Qəmər tələtli, bir xurşid rüxsar,
Atası qıldı həqqə şükri-büsyar.
Gətirdilər münəccim, dedi sultan:
Ki, ey rövşən rəvan, mərdi-süxəndan,
Bu oğlan necədir, məmduhü[6] məzmum[7],
Nə vardır taleyində eylə məlum.
Münəccim rəmlü istirlabə[8] baxdı,

[1] Üzük qaşı kimi dairəyə almaq
[2] Kəramətli
[3] Lüt
[4] Pul
[5] (vergidən) azad
[6] Tərifə layiq
[7] Məzəmmət edilməli
[8] Falçıların fal aləti

Nə vardır taleyində ona baxdı.
Bu rəmzi qılmaq olmaz – dedi zinhar,
Vəlakin söylərəm çün oldu naçar.
Yetişsə – dedi – yeddi yaşa oğlan,
Ölür əlbət onun əlində sultan.
Gərək saxla, gərək sən eylə məfhum,
Bizə əhval belə oldu məlum.
Eşitdi çün münəccimdən bu sözü,
Fəraq[1] əl verdi şaha dolu gözü.
Bu sözdən düşdü çox fikrü gümanə,
Nə oğlanə qıyar, nə qıydı canə
Var idi bir biyaban, dur əzrah[2],
Məgər var idi onda bir gühən[3] çah.
Tutub dayə pəs ol sultani-sərvər,
Məkanın eylədi onda müqərrər.
Çü gördü dayə yoxdur çarə tədbir,
Verərdi oğlana ol çahidə şir[4].
Vəli bir kimsə təyin eyləmiş şah,
Xəbərdar ola ondan gahü bigah[5],
Xəbərdar olmadı kimsə bu halə,
Çü oldu onda oğlan həftsalə[6].
Var idi bir dəvə əndər biyaban,
Gəzərkən uğradı ona bir aslan.
Çü hiylə qurdu aslan, qaçdı dəvə,
Düşüb ardınca aslan qova-qova
İkisi dəxi ol dəm düşdü çahə,
Qaçıb gizləndi oğlan bir bucağə.
Dəvəni, övrəti çün yırtdı əslan,
Yeməyə durdu çün ol şiri qərran[7].
Pəs o oğlanə çün həqq verdi tofiq,
Qaçıb ol çahidən qurtardı təhqiq.

---

[1] Ayrılıq
[2] Yoldan uzaq
[3] Köhnə
[4] Süd
[5] Vaxt aşırı
[6] Yeddi yaşlı
[7] Yırtıcı

Yeridi, durmayıb ol qaçdı dağə,
Nihan etdi, özün çəkdi qırağə.
Dəvə istəməyə gəldi şütürban,
Dəvəni görməyib tapdı bir oğlan.
Nə oğlan? Bəlkə bir dürri-yeganə,
Ki, misli yox idi əndər zəmanə.
Onu çün gördü oldu şadü xəndan
Götürdü, evinə gəldi şütürban.
Atadan yaxşı ona mehribanlıq
Qılır cansuzluq, həm canfişanlıq.
Çü rədd olmuş imiş təqdiri-Allah,
Bu halə olmadı heç kimsə agah.
Məgər bir gün qılır sultan müqərrər,
Gedə ol quyu üstə bir neçə ər.
Gətirələr ona ol məhliqani,
Gətirsinlər, təsəlli ala cani.
Gəlib ol quyu üstə mötəmidlər[1],
Təfəhhüs həm təcəssüs[2] eylədilər.
Tapa bilmədilər ol nöcəvani,
Sümükdən özgə yox onda nişani.
Yük oldu bu əhvalə çü sultan,
Təəssüf çəkib oldu zarü giryan.
Pərişan oldu ol əfkari-nömid,
Təməh ondan götürdü, kəsdi ümmid.
Vəli oğlan şüca, oldu dilavər,
Onunla kimsə gəlməzdi bərabər.
Bəhəm yetirdi ol bir neçə yoldaş,
Cəlalliyyü hərami oldular faş.
Özünə uydurub çox pəhləvani,
Dağıtdı, handa gördü karivani.
Ona eyləmədi heç kimsə çarə.
Yetirdilər bu sözü şəhriyarə.
Ki, bənd oldu[3] şəha, yollar təmami,
Cahani sərbəsər tutdu hərami[4].

---

[1] Etimadlı adamlar
[2] Axtarış
[3] Bağlandı
[4] Oğru, quldur

Hərami dünyanı eylədi qarət,
Ziyadə oldu nöqsanü xəsarət,
Gərəkməz bu işə ehmalü təqsir,
Buna etmək gərək bir çarə, tədbir.
Eşitdi bu sözü, atlandı sultan,
Onunla getdi çox ləşgər firavan
Yetişdi onların üstünə çün şah
Səlabətdən[1] olar çün oldu agah,
Dedi oğlan: pəs ol dəm, ey yaranlar![2]
Bu gün qeyrət günüdür pəhləvanlar!
Kim olsa mərd əndər ruzi-meydan,
Qılır əlbəttə ol öz qanına qan.
Zireh cövşən[3] əlinə aldı şəmşir,
Həvalə oldular bifikrü tədbir.
Məgər oğlan həvalə oldu şahə,
Vurub bir zəxmi[4]-möhkəm padşahə,
Hücum eylədi ləşgər yer-yerindən,
Ağır gəlsə, yüngül qalxmaz yerindən.
Pəs oğrular qamu məcruhü xəstə,
Giriftar oldu cümlə dəst-bəstə.
Apardılar qamusun şəhrə dustaq,
Vəli sultan yaradan oldu naçaq,
Çağırdı dərzaman gəldi münəccim,
Dedi: yalan dedin, sən mənə ol dəm,
Mənim oğlum quyuda idi, ol şir,
Mənə bir özgə verdi zəxmi-şəmşir,
Münəccim dedi: dana cahil olmaz:
Ki, təqdiri-ilahi batil olmaz.
Əgər oğlun əlindəndir bu yarə,
Dəxi yoxdur ona tədbirü çarə.
Əgər ki, qeyridəndir bu məzərrət[5]
Şəha, vardır sənə imkanü sihhət,

---

[1] Qorxulu, heybətli
[2] Dostlar
[3] Dəmir geyim
[4] Yara
[5] Zərbə

Qəza bil ki, yəqin rədd olmaz ey şah!
Yamanın[1] gəlməsin, sən ol gəl agah.
Əgər yetişməyibdir ona nöqsan,
Səni qətl eyləyər axır o, oğlan.
Münəccimdən eşitdi bu peyami,
Çağırdı yanına ol növcavani.
Dedi ona: Mənə söylə nə kimsən?
Atan kimdir, nə yerdir sizə məskən?
Dedi oğlan: Atamdır bir şütürban,
Onu istədilər, buyurdu sultan.
– Gəl indi doğru söylə sən həqiqət
– Sənin oğlundur bu pak tələt?
Dedi şaha yəqin, təhqiq, məlum,
Bu bir yeddi yaşında tifli-məsum,
Gəzərdim mən dəvə üçün bu dağda,
Nihan gördüm oturub bir qıraqda.
Gətirdim, saxladım, dedim yetimdir,
Vəli bilməm onun atası kimdir?
Yenə pəs dedi sultan ol cavanə:
– Həqiqət söylə, biüzrü[2] bəhanə,
Nə üçün getmiş idin sən bu dağə?
Necə gizlənmiş idin bir bucağə?
Dedi oğlan kim: "Ey şahi güzidə!
Anam ilə olurduq bir quyudə
Ki, nagah düşdü bir dəvə bir aslan,
Özümü eylədim bir küncə pünhan.
Bilirəm, mənə məlum oldu təhqiq,
Quyudan çıxmağa həqq verdi tofiq.
Xilas oldum, qaçırdım baxa-baxa,
Yetişdim kuh saru[3], səngilaxa[4].
Dedim gəlir yenə ardımca aslan,
Bu qorxudan mən oldum orda pünhan.
Eşitdi şah bu əsrari-nihani,
Üzündən öpdü təslim etdi cani.

---

[1] Acığın
[2] Üzürsüz
[3] Dağa tərəf
[4] Daşlıq yer

Budur şahzadə təhqiq oldu məlum,
Deyərdi: ey driqa babi-mərqum!
Əza tutdu atasıçün müsibət,
Yığıldı hamusu ərkani-dövlət,
Ayağın öpdülər hamısı bir-bir,
Rəva görmədilər xidmətdə təqsir.
Başına qoydular həm taci-izzət.
Yığıldı hamısı ərkani-dövlət
Atasından dəxi oldu ziyadə,
Muradinə yetişdi şahzadə.
Yəqin bil yox imiş təqdirə çarə,
Necə hökm etsə kimsə kirdigarə?
Mənimçün yoxsa gər təqdiri Allah,
Məni öldürə bilməz bigünah şah.
Tamam edincə ol bu dastani,
Günün qalmadı asarü nişani.
Fədai, kimsəyə neyləyə bədxah,
Çü rədd olmaz imiş təqdiri-Allah.
Yenə zindançiyə buyurdu sultan,
Apardılar pəs onu suyi-zindan,

## VƏZİRLƏRİN GƏLİB PADŞAHA ƏRZ ETMƏLƏRİ

Sabah oldu yenə gəldi vəzirlər,
Oturdular divanə cümlə yeksər.
Şikayət eylədilər yenə bünyad,
Ki: şaha, sən eşitməzsən məgər dad?
Üzümüzdə bizim həm qalmadı qan,
Xəlayiq tənəsindən bari utan!
Deyər o dastan, sən eylərən guş[1],
Bu gün o adəti eylə fəramuş.
Gətirmə sən yanına belə söylə,
Yenə tapar özüyçün bir vəsilə.
Qulaq asma, necə kim eyləsə dad,

[1] Qulaq asmaq

Buyur qətl eyləsin filhal cəllad.
Bu sözləri eşitdi çünki sultan,
Ona əl verdi qeyrət, qaynadı qan.
Acıqlandı yenə oldu qəzəbnak,
Dedi cəlladə sən dur, çəstü çalak[2]
Apardı qətlgaha Bəxtiyari,
Yığıldı onda gəldi xəlq vari[3].
Qılırsan ona eyzavü əhanət,
Üqübət[4] eylə ənvai-siyasət.
Pəs ondan eylə onu parə-parə,
Baxıb xəlqi-cahan etsin nəzarə.
“Baş üstə!” – dedi düşdü yola cəllad,
Vəzirlər qamü oldu xürrəmü şad.
Aparmaq oldu yəqin qətligahə,
Siyasətlər qılarlar bigünahə.
Xəbərdar oldu qamu şəhrü bazar,
Yığıldı el, vilayət, hər nə kim var.

## BİÇARƏ BƏXTİYARIN QƏTLİGAHA APARILMASI VƏ ZİYAD HƏRAMİNİN TAPILMASI

Qəribü bikəsü biyarü, qəmxar,
Pərişan, müztərib, ol diləfkar,
Nə kimsə var ona qıla şəfaət,
Nə xud vardır ona imkani-möhlət.
Əlaci yox, riza verdi qəzayə,
Könül bağladı sidqilə xudayə.
Bəli, həqdən qəza olmasa nazil,
Qəzayə kim qılır təqdir təbdil.
Həqqin tədbirini heç kimsə bilməz,
Əcəl yetməz əgər həqdən üzülməz.

[1] Təcili
[2] Hamı
[3] Əziyyət

Müqərrər olmasa heç kimsəyə mərg,
Ağacdan düşməz imiş vədeyi-bərg[1].
Əgər həqdən yetişə əmrü fərman,
Nə çarə eyləyən vardır, nə dərman.
Gəl indi gör qəzayi-girdigarə,
Necə qıldı inayət Bəxtiyarə!
Gör indi ol Ziyad olan Hərami
Ki, saxlamışdı ol nikinami.
Ki, tapmış Bəxtiyari dərbiyaban,
Gətirib etmiş idi onu oğlan.
Gecə-gündüz qılırdı ahü fəryad,
Deyərdi: var ola, yarəb Xudadad[2];
Qəzara eşidib ol Bəxtiyari,
Ki, sultan ona vermiş ixtiyari.
Qamulardan onu qılmış sərəfraz,
Ziyadın mürqi-ruhi[3] etdi pərvaz.
Sanasan zövqdən od düşdü canə,
Onu görmək üçün oldu rəvanə.
Qəzara getdi şəhrə ol zəmanda
Xəlayiq tənə eylər hər zamanda
Düşübdür şəhrə bir aşubü qovqa,
Kimi ağlar, kimi eylər tamaşa.
Sərasimə olub dedi: ki, yaran,
Nədir bu şurü şər, fəryadü əfqan?
Dedilər necə kim keçmişdi əxbar,
Diləfkarü pərişan oldu ağlar.
Xəbərdar oldu çün ol günüqarə,
Özün yetirdi dərdəm Bəxtiyarə.
Özünü Bəxtiyar üstünə saldı,
Pəs ol cəllad əlindən tiği aldı
Dedi cəlladə: sən eylə mürüvvət,
Amandır ver mənə bir ləhzə möhlət,
Rizayi-həqq üçün et bir dəm mudara,
Özümü yetirim mən şəhriyara.

---

[1] Yarpaq
[2] Xudadad sağdırmı?
[3] Könül quşu

Verim sultanə onun xun bahasın[1]
Gər istərsən sənə olmuya nifrin.
Qəbul etməyə, qıla qəhrü kinə,
Məni öldür sən onun əvəzinə.
Səvaba daxil eylə özünü sən,
Görə bilməm onun ölümünü mən.
Bu oğlandır mənə fərzənd dilbənd,
Dəxi yoxdur mənə bir qeyri fərzənd.
Ziyad ilə var idi neçə həmrah[2],
Gəlib sultana onu qıldı agah,
Dedi versin ona cəllad möhlət,
Ziyadə: – Gəl! Deyib qıldı işarət.
Yetişdi çün şaha qıldı sicudi,
Oxudu çox səna ilə drudi[3].
Dedi sultan ona: ey kədxuda sən,
Bu oğlan ilə necə aşinasən?
Dedilər, sən deyibsən ona fərzənd,
Oğul, atasına olmazmı manənd[4]
Oğul ilə olur atası böylə,
Yalan demə həqiqət, doğru söylə!
Dedi: şaha mənəm məşhurü nami,
Ziyad adım, cahanda bir hərami.
Mənimlə var idi bir neçə yoldaş
Qamu rindü, hərami zeydü, qüllaş
Görüncə dağıdırdıq karvanı,
Əlimizdən gedən qurtardı canı.
Gözətlib[5], karvan çöldə gəzərdik
Yetişdik bir bulaq üstündə gördük,
Bir oğlan dərmiyani[6] müşgü ənbər,
Nə oğlan? Sanasan xurşidi-ənvər.
Qamu zərbəft ətlasdır libasi,
Vəli yanında yox hazır atası.

[1] Qan bahası
[2] Yoldaş
[3] Dua
[4] Oğul atasına oxşamazmı
[5] Gözləyib
[6] İçərisində

Başı üstündə var bir bədreyi-zər,
Mən onu görcək ey sultani-sərvər,
Uzadıb əl onu yerdən götürdüm,
Yetincə ta rəfiqlər, mən götürdüm.
Yox idi oğlum, ey şahi-cahandar,
Dedim oğlum bu olsun, qıldım iqrar.
Oğul dedim mən ol ziba liqayə
Müəyyən eylədim pəs ona dayə.
Əmizdirdi onu, süddən ayırdı.
Onun başına dövlət sayə saldı,
Müqərrər eylədim mən ona ustad,
Onun adını qoymuşdum Xudadad.
Pəs oldu sahibi-idrakü tədbir,
Mən onda görmədim heç gunə təqsir.
Dedi: hani nə yerdə rəxtü camə,
Ki, sarmışdı ana, ol nikinamə?
Dedi: hazır evimdə vardır onlar,
Rəvan durma gətir, sən onu zinhar.
Ziyad oldu rəvan pəs suyi xanə,
Gətirdi onları bəhri-nişanə.
Nəzər qıldı çü şah, rəxtü libasə,
Yetişdi ol dəxi yaxşı əsasə.
Götürdü onları getdi bəxanə,
Çağırdı xatunun fəxri-zəmanə.
Dedi xatuna: qıl indi qiyasi,
Gətirdim, tanırmısan bu libasi?
Görüncə qıldı əfqanü xruşi,
Başından getdi onun əqli huşi.
Gətirdi şuşa sultan ol nigari,
Yenə qıldı fəqanü ahü zari.
Dedi: ol rəxtidir, bu ey xudavənd,
Kim ona çulqadın fərzəndi-dilbənd,
Məgər ol gün ki, biz olduq giriftar,
Qaçıb Kirmanə getdik badilizar.
Məgər kim buldu həqq verdi inayət,
Vücudə gəldi ol xurşidi-tələt.
Bulaq başında düşmən qorxusundan,
Salıb onu qaçıb can qorxusundan,

Bu rəxt içində ol əbru-kəmani
Qoyub getdik, budur onun nişani.
Dedi sultan ki, mən düşdüm gümanə,
Vücudunda dəxi gördü nişanə.
Dedi gördüm ondan ey xudavənd,
Ayaqda barmağı bir-birə peyvənd.
Əgər belə isə təyinü təhqiq,
Bu sözdən dəxi hasil oldu təsdiq.
Gətirdilər buyurdu ol cavani,
Ayaqda gördü vardır ol nişani.
Buyurdu açdılar ol Bəxtiyari,
Üzündən öpdü getdi ixtiyari.
Özünə gəldi ol şahi-cahandar,
Dedi: ey nazənin fərzəndi-qəmxar!
Gözüm nuri, mənim ümidgahim!
Yaman günümdə sən püştü pənahim,
Mürəsse tac həm zərbəft xələt,
Geyindi Bəxtiyari-pak tələt,
Anası çün oğul üzünə baxdı,
Südü əmcəklərindən dərdəm axdı.
Dolandı başına, öpdü gözündən,
Ayağına düşüb getdi özündən.
Çü xatun gəldi ol dəmdə özünə,
Baxardı oğlanın hərdən üzünə,
Dedi: yuxudadır, yoxsa bu agah?
Nəzər qıldı mənə lütf etdi Allah.
Oğul vəslindən ana oldu dilşad,
Anası oldu bəndi-qəmdən azad!
Bina oldu əsasi-eyşü-işrət,
Süpahi şadiman, şakər[1] rəiyyət.
Nağara döydülər, təblü büşarət,
Döşəndi hər nə var, ali imarət.
O şəhr içində qırx gün oldu bayram
Hamıya qıldı şah ehsanü ənam.

**İntəha.**

[1] Minnətdar, şükür edən

MÜNDƏRİCAT

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Tərtibatçı-rəssam: *Nərgiz Əliyeva*

Kompyuter səhifələyicisi: *Rəşad Həmidov*

Korrektor: *Pərvanə Məmmədova*

Yığılmağa verilmişdir 09.06.2004. Çapa imzalanmışdır 21.12.2004.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 10,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 244.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.